| | |
|---|---|
| رخش حجت[۱] تند ایکن سیران افلاک ایده کور، | *Rəxşi-hüccət tünd ikən, seyrani-əflak edə, gör,* |
| عرشه صور آتدن طواف عالمی خاک ایده کور. | *Ərşə sür atdan təvafi-aləmi xak edə, gör.* |
| آدم خاکییه شاکرد اول اوخی اسماء کل، | *Adəmi xakiyə şagird ol , oxı əsmai-kül,* |
| صورتی رحمانه باخ شیطانی غمناک ایده کور. | *Surəti rəhmana bax, şeytanı ğəmnak edə, gör.* |
| روی زیبادن کم اول حسنی ملاحت متنی در، | *Ruyi-zibadan kim, ol hüsni məlahət mətnidir,* |
| علم الاسماء حسنا شرحن ادراک ایده کور. | *Elmul əsmai hüsnə şərhin idrak edə, göe.* |
| قنده بقسک انده وجه اللـه استرسک نظر، | *Qanda baxsan anda vəcullaha istərsən nəzər,* |
| غیر نقشنده کوکل آیینه سن پاک ایده کور. | *Qeyri-nəqşində könül ayinəsin pak edə, gör.* |
| واقف اسرار سبحان الذی اسرایسک، | *Vaqifi-əsrari-Sübhan əlləzı əsrarısan,* |
| بر جمال کعبه کورکج کوکسکی چاک ایده کور. | *Bir camalı-Kəbə görkəc köksini çak edə, gör.* |
| عاقبت بیت الحزن ویرانه سی اولور تنک، | *Aqibət beytul-həzən viranəsi olur təng,* |
| حالیا بر جرعه دن جانی طربناک ایده کور. | *Haliya bir cürədən canı tərəbnak edə, gör.* |
| ای **سروری** معجزاتی خواجۀ لولاکدن، | *Ey Sururi, möcizati xaceyi-lolaikdən,* |
| رخش همت تندایکن سیران افلاک ایده کور. | *Rəxşi himmət tünd ikənŞ seyrani-əflak edə, gör.* |

ولـه

| | |
|---|---|
| اول که عنوان ملاحت قاشی طغراسنده در، | *Ol ki, ünvani-məlahət qaşı tuğrasındadır.* |
| لیله الاسرا سری زلفی سمنساسنده در. | *Leylətul-əsra səri-zülfi səmənsasındadır.* |
| عنبرین خطی علی العرش استوادن شرح ایدر، | *Ənbərin xətti ələlərş ustuvadan şərh edər,* |
| کم کلام اللـه آنک رخسار زیباسنده در. | *Kim. kəlamullah anın ruxsari-zibasındadır.* |
| قامتی رعناسی بر نخل[۲] بلادر کم آنک، | *Qaməti rənayi bir zilli-bəladır kim, anın,* |
| باغ حسنک ترکسی فتانی بالاسنده در[۳]. | *Bağı-hüsnün nərgisi fəttani balasındadır.* |
| غمزۀ غمازینک سحرین کورنلر دیر بکیم، | *Čəmzeyi-ğəmmazının sehrin görənlər dir, bəgim,* |
| قندسی اخر زمانک عین شهلاسنده در. | *Qandası axir zamanın eyni-şəhlasındadır.* |
| باشنی میدان عشق ایچنده طوب ایتمک کرک، | *Başının meydani-eşq içində tob etmək gərək,* |
| کیم که اول چابک سوارک زلف سوداسنده در. | *Kim ki, ol çabuk səvarın xülfi-sevdasındadır.* |
| کوستررلر کعبۀ ارباب معنیدن نشان، | *Göstərirlər Kəəbeyi-ərbabi-mənidən nişan,* |
| هرنه بنلر کیم مسیحانک کلیساسنده در. | *Hər nə bunlar kim, Məsihanın kilisasındadır.* |
| ای **سروری** علم الاسماء تحصیل ایله کل، | *Ey Sururi, elmul-əsami təhsil eyləgil,* |

---

۱. س. همت
۲. واتیکان ظل
۳. باشقا نسخه لرده یوخدور// واتیکان نوسخه سینده بورادا صفحه دوشمه سی وار.// س. نوسخه سینده وار ص.۱۳

کیم تسما آدم خاکینک اسماسنده در. *Kim, təsəmma, adəmi-xakinin əsmasındadır.*

ولـه[1]

آه کیم کوکلم اوی غمدن خراب اولمقده در، *Ah kim. könlüm evi ğəmdən xərab olmaqdadır,*
سیل اشکم اغلمقدن خوناب اولمقده در. *Seyli-əşkim ağlamaqdan xunab olmaqdadır.*
قیلمه سون سرو خرامانک تماشاسک دیو، *Qılmasın sərvi-xuramanın təmaşasın deyü,*
کوزلرمدن اشک ایدوب اشکم حجاب اولمقده در. *Gözlərimdən əşk edib, əşkim hicab olmaqdadır.*
سایهٔ سرو خرامانکله ای روح روان، *Sayeyi-sərvi-xuramanınla, ey ruhi-rəvan,*
چشمهٔچشمم الف التنده اولمقده در. *Çeşmeyi-çeşmim əlif altında olmaqdadır.*
اولورم سودای زلفکله کیم آهم شعله سی، *Oluram sevdayi-zülfünlə kim, ahım şöləsi,*
باشم اوستنده یلان تک پیچ تلب اولمقده در. *Başım üstündə ilan tək piçu tab olmaqdadır.*
اویله دریای محیط اولدی سرشکم کیم آکا، *Öylə dəryayi-mühit oldı sirişkim kim, ana,*
کهکشانده موج کوکبدن حبلب اولمقده در. *Kəkəşanda mövci-kövkəbdən hubab olmaqdadır.*
عنبرافشان سبنلکله عارضندن هر نفس، *Ənbərəfşan sünbülündə arizindən hər nəfəs,*
کوکده ،هم همنشین آفتاب اولمقده در. *Gökdə həm həmnişini-aftab olmaqdadır.*
تا **سروری** کوردی رخسارندن قران معجزین، *Ta Sururi gördi rüxsarından Quran möcizin,*
بنده ء من عنده علم الکتاب اولمقده در. *Bəndəyi-men əndəhu elmul-kitab olmaqdadır.*

ولـه[2]

قنقی سنبلدر که مشکین کاکلک تک تلب وار، *Qanqı sünbüldür ki, müşkün kakilin tək tabı var,*
قنقی نرکسدر که سرخوش کورلرک تک خلب وار. *Qanqı nərgisdir ki,sərxoş gözlərin tək xabi var.*
قنقی شاخ کلدر ای نخل ملاحت کیم آنک، *Qanqı şaxi-güldür ey nəxli-məlahər kim, anın,*
لعل خندانک تکی بر غنچهٔ سیراب وار. *Ləəli-xəndanın təki bir ğönçeyi-sirabi var.*
صانمه مه نو شفقدن دوغری کیم کتمسه کونش، *Sanma məhi-nov şəfəqdən doğru kim,getməsə günəş,*
لعل پرخون کیم قاشندن صورت محراب وار. *Ləəli purxun kim, qaşından surəti-mehrabi var.*
قانه غرق اولدی غمی خالکله چشمم مردمی، *Qana ğərq oldı ğəmi-xalına çeşmim mərdumi.*
مور مسکینک نه مشکل آفت کرداب وار. *Muri-miskinin nə muşkil afəti-gitdabı var.*
کلدی کل آچلدی نرکس لاله دولدی ژاله دن، *Güldi. gül açıldı nərgis. lalə doldı jalədən.*
ای خوش انک وقتی کیم عیش ایتمکه اسباب وار. *Ey xoş anın vaxtı kim, eyş etməyə əsbabı var.*
ای **سروری** چاک سینم یاریلوب دیر یاره کیم، *Ey Sururi, çaki-sinəm yarılıb, dır yara ki,*

---

[1]. باشقا نوسخه لرده یوخدور// س. نوسخه سیندهوار. ص. ۱۳
[2]. باشقا نوسخه لرده یوخدور// س. نوسخه سیندن الینیبدیر. ص. ۱٤

*Tiği-eşqin tək nə burcun mehri-aləmtabi var.* تیغ عشقک تک نه برجک مهر عالم تاب وار.

ولـه[۱]

*Şəəmi rüxsarın ki, mehru mah anın heyranıdır,* شمع رخسارک که مهر و ماه آنک حیرانیدر،
*Murği-dil pərvanəsidir, didə sərgərdaıdır.* مرغ دل پروانه سیدر دیده سرکردانیدر.
*Asitanından cuda qan olduğuçün yaşımın,* آستانکدن جدا قان اولدیغیچون یاشمک،
*Ağlasam, eyb etməgil, ey gül ki, bağrım qanıdır.* آغلسم عیب ایتمه کل ای کل که بغرم قانیدر.
*Həmdəm olmaq səgi-kuyinlə, ey sultani-hüsn,* همدم اولمق سکی کویکله ای سلطان حسن،
*Mən ğəribi-binəvaya dövləti-sultanidir.* من غریب بی نوایه دولت سلطانیدر.
*Məndə taqət qalmadı jicrana, lütf et. ey əcəl,* منده طاقت قالمدی هجرانه لطف ایت ای اجل،
*Canımı alğıl ki, canan özgələr cananıdır.* جانمی الغل که جانان اوزکه لر جانانیدر.
*Necə bir əğyarı yar ilə görüb. ğəmgin olam,* نیجه بر اغیاری یاریله کوروب غمکین اولم،
*Ömrümün dövri bənim bənzər ki, ğəm dövranıdır.* عمرمک دوری بنم بکزر که غم دورانیدر.
*Vəh ki, illərdir ki, bir gül üzlü dilbərdən cuda,* وه که یللردر که بر کل یوزلو دلبردن جدا،
*Dudi-ahım əbru ğəm yaşım bəla baranıdır.* دود آهم ابر و غم یاشم بلا بارانیدر.
*Razi ol, ol gül nə covr etsə Sururi canına,* راضی اول اول کل نه جور اتسه **سروری** جانکه،
*Çün cəfa qılmaq pəri-rüxsarlar ərkanıdır.* چون جفا قلمق پری رخسارلر ارکانیدر.

ولـه[۲]

*Sünbülün kim, arizin dövründə ənbər dağıdır,* سنبلک کیم عارضک دورنده عنبر داغیدر،
*Sanıram Ruhulqudus ərş üzrə sepeh dağıdır.* صانرم روح القدس عرش اوزره سپهر داغیدر.
*Mehrinə gün müştəri olmaq üçün, ey məhləqa,* مهروکه کون مشتری اولمقیچون ای مه لقا،
*Ayağına baş qoyub, gökdən yerə zər dağıdır.* آیغوکه باش قویوب کوکدن یره زر داغیدر.
*Rəşk edib xurşidi-çeşmim mərdumi xunabdan,* رشک ایدوب خورشید چشمم مردمی خونابدن،
*Eşikindən zər yerinə ləəlu gövhər dağıdır.* ایشکندن زر یرنه لعل کوهر داغیدر.
*Dövri-hüsnündən səba gülşən hesabın verməyi,* دور حسنکدن صبا کلشن حسابک ویرمکی،
*Sünhdəm güldən gəlir, divanə dəftər dağıdır.* صبحدم کلدن کلور دیوانه دفتر داغیدر.
*Vəh necə şirin təkəllümdır ləbin kim, söyləkəc,* وه نیجه شیرین تکلم در لبک کیم سویله کج،
*Bir yana qənd axıdır, bir yana şəkkər dağıdır.* بر یکا قند آخیدر بر بکا شکر داغیدر.
*Saqiya sun badəyi-gülgün ki, şəkkər çəksə ğəm,* ساقیا صون باده کلکون که شکر چکسه غم،

---

[۱]. باشقا نوسخه لرده یوخدور// س. نوسخه سیمده وار. ص. ١٤
[۲]. باشقا نوسخه لرده یوخدور// س. نوسخه سیمده وار. ص. ١٥

| | |
|---|---|
| کمسه داغتمز آنی الا که ساغر داغیدر. | *Kimsə dağıtmaz anı, illa ki, sağər dağıdır.* |
| ای **سروری** بر بهادردر شراب ناب کیم، | *Ey Sururi, bir bahadırdır şərabi-nab kim,* |
| کوز قیزردوب قنده ینه یاش آلور ار داغیدر. | *Göz qızardıb qəndə yinə baş alır, ər dağıdır.* |

ولـه[1]

| | |
|---|---|
| زاهدا اسماء وصلینک مسماسی ندر، | *Zahida, əsmai-vəslinnin müsəmmasi nədir?* |
| یا حقک عینی مسما اولان اسماسی ندر. | *Ya həqqin eyni-çüsəmma olan əsmasi nədir?* |
| عارف بزم ازل اولمق بمنزلدر یقین، | *Arifi-bəzmi əzəl olmaq bəmənzildir yəqin,* |
| یا شراب وحدتک جام مصفاسی ندر. | *Ya şərabi-vəhdətin cami-müsəfası nədir?* |
| مصر جامع جمعهٔ آینه نیچوندر عجب، | *Misri came cüməyi-ayinə nəçündür . əcəb,* |
| یا سوادی اعظمک آنده تماشاسی ندر. | *Ya səvadi-əəzəmin anda təmaşası nədir?* |
| واقف شرحینی اللـه ایسک شرح ایله کم، | *Vaqifi-şərhini allah isən şərh eylə kim,* |
| کعبه نک کنزی شب معراجک اسراسی ندر. | *Kəəbəni kənzi, şəbi-meracın əsrası nədir?* |
| وادی ایمنده موسی کلیم اللـه ایچون، | *Vadiyi-imendə Musayi kəlim allah üçün.* |
| آیت انی انا اللـهک تجلاسی ندر. | *Ayəti ini ənəllahın təcəllası nədir?* |
| سور اسرافیل قندندر حیات کائنات، | *Suri-israfil qandadır həyatı-kayinat,* |
| روح قدسک نفخهٔ عیسی سی انفاسی ندر. | *Ruhi qudsun nəfxəyi İsası , ənfasi nədir?* |
| قنقی مظهرده ظهور ایلر بیان قل کفی، | *Qanqı məzhərdə zuhur eylər bəyani-qul kəfi,* |
| حجت القائم قتی کلمدقی دعواسی ندر. | *Hüccəti qaim qəti qılmaqdakı dəvasi nədir?* |
| شاه باز روح سفلی آشیانن ترک ایدوب، | *Şahbazı ruhi-sufla aşiyanın tərk edib,* |
| عالم علوی پرواز اتسه ماواسی ندر. | *Aləmi ülviyə pərvaz etsə, məvasi nədir?* |
| کر کلام اللـه نطقن اوقورسه سویلکل، | *Gər kəlamullah nitqin oxursa, söyləgil,* |
| قاف و القران ایله یاسین و طاهاسی ندر. | *Qafu Quran ilə Yasim u Tahası nədir?* |
| باش چکرسن چون معنبر طرّه بردن دیو تک، | *Baş çəkərsən çün müənbər türrə birdən div tək,* |
| بس بو معجز نافه نک کوستر که طغراسی ندر. | *Pəs bu möciz nafənin göstər ki, tuğrası nədir?* |
| هر زمان بر دلبرک زلف دلاویز اولدغی، | *Hər zaman bir dilbərin zülfi-dilaviz olduğı,* |
| قنقی یوزدندر بو سودانک مداراسی ندر. | *Qanqı üzdəndir bu sevdanın mudarası nədir?* |
| روز و شب بو قبهٔ احضرده خورشید و قمر، | *Ruzu şəb bu qubbəyi-əhzərdə xurşidu qəmər,* |
| نه سببدن دور ایدر یارب تمناسی ندر. | *Nə səbəbdəndir edər yarəb, təmənnası nədir?* |
| ای **سروری** واقف سر کلام اللـه اولان، | *Ey Sururi, vaqifi-sirri-kəlamullah olan,* |

[1]. باشقا نوسخه لرده یوخدور. س. نوسخه سیندن آلینیبدیر. ص. ۱۹

تا ابد بیلور که هر اسمک مسماسی ندر. *Ta əbəd bilir ki, hər ismin müsəmması nədir?*

## **قافیهٔ الزاء** – عدد(۱۷) ۲۲

ولـه

طلبده یارک اردنجه بو کوکلم تک او یار اولمز، *Tələbdə yarın ardınca bu könlüm tək o yar olmaz,*
ولی بیک جهد ایلرسه بوکا هرکز او یار اولمز. *Vəli bin cəhd eylərsə, buna hərgiz o yar olmaz.*
ددک دریای هجر ایچره کنار استر بنم کوکلم، *Dedin dəryayi-hicr içrə kənar istər bənim könlüm,*
ددی بنم غمم بحرینه دوشنه کنار اولمز. *Dedi bənim ğəmim bəhrinə düşənə kənar olmaz.*
ددک مرآت قلبه انکسار ار کوردی سنک غم، *Dedin merati-qəlbinə inkisar ər gördi səngi-ğəç,*
ددی هر پارده نقشم اولور بو انکسار اولمز. *Dedi: hər parədə nəqşim olur, bu inkisar olmaz.*
ددم لطف ایلکل اغلتمه بنی ای کل رعنا، *Dedim: Lütf eyləgil, ağlatma bəni, ey güli-rəna,*
ددی باران کم اولمایه کل اچلمز بهار اولمز. *Dedi: Baran kim olmaya, gül açılmaz,bahar olmaz.*
**سروری** اویدرپ اغیاری یاران جست و جو ایلر، *Sururi uydurub əğyari, yaran, çüstu cu eylər,*
ولی اول کوزلری اهو اکا هرکز شکار اولمز. *Vəli ol gözləri ahu ana hərgiz şikar olmaz.*

ولـه نظیرهٔ روانی

زلفیله یوزن اورته لی اول کلعذارمز[1]، *Zülfilə üzün örtəli ol gülüzqrımız,*
صان کورن دوتلدی کیجیه دوندی نهارمز[2]. *San görən dutuldı,gecəyə döndi naharımız.*
بن قاره کونلوده قومه دی صبرله قرار، *Bən qara könlüdə qomadı səbrilə qərar,*
اول قاره زلفله قنی قول و قرارمز[3]. *Ol qara xülfilə qanı qövlu qərarımız.*
دل صفحه سنده قالمدی محو اولدی شکل غیر، *Dil səfhəsində qalmadı, məhv oldı şəkli qeyr,*
نقشک مصور اوللیدن ای نکارمز. *Nəqşin müsəvvər olalıdan, ey nigarımız.*
عیسیدن استمک بزه احیا ایچون دعا، *İsadan istəmək bizə əhya üçün dua,*
چون تیغ زجر و هجر ایله اولدردی یارمز. *Çün tiği-zəcr u hicr ilə öldürdi yarımız.*
دنیا سرابن اب صانوپ اعتبارده، *Dünya sərabın ab sanıb etibarda,*
قودی بزی یبانده قوری اعتبارمز[4]. *Qodi bizi yabanda qurı etibarımız.*
کرداب درده صلدی بزی فرقتک دریغ، *Girdabi-dərdə saldı bizi firqətin, dəriğ,*
ای خضر جان نجه اولسر روزکارمز *Ey Xizri-can , necə olisər ruzigarımız?*
اول یار حسرتنده **سروری** ایله بزُم، *Ol yar həsrətində Sururi ilə bizim,*

---

[1]. پروانه مجموعه سی : ۳۰۸۲
[2]. پروانه مجموعه سی: بو بیت یوخدور
[3]. پروانه مجموعه سی: دیلدن آپاردی قومدی صبر و قرارمز//عشقنله بویله می ایدی قول و قرارمز
[4]. پروانه مجموعه سی: بو بیت یوخدور

| | |
|---|---|
| آه و فغان و ناله و زار اولدی کارمز. | *Ahu fəğan u nalə vu zar oldı karımız.* |

ولـه نظیرهٔ اسحق چلبی

| | |
|---|---|
| ندن بلسم عجب یاری بکا هرکز یقین اولمز، | *Nədən bulsam əcəb yarı bana hərgiz yəqin olmaz,* |
| ملکدر وارسه دلبرکه ادمله قرین اولمز. | *Mələkdir, varsa dilbərinə adəmlə qərin olmaz.* |
| طواف کوی یار ایلر رقیبی بر سحر کوردم، | *Təvafi-kuyi-yar eylər rəqibi, bir səhər gördüm,* |
| عجب بو قبله یه کافر بچق ساعت یقین اولمز. | *Əcəb bu qibləyə, kafər biçaq saat yəqin olmaz.* |
| عذارک کفر زلفکله نچون پنهان ایدرسنکم، | *Üzarın küfri-zülfünlə neçün pünhan edərsən kim,* |
| که کفر ایچنده می کافر بلورسن اهل دین. | *Ki, küfr içindəmi kafər bilirsən əhli-din (olmaz),* |
| رقیبه کشف راز ایدپ یوزک کوسترمه ای دلبر، | *Rəqibə kəşfi-raz edib, üzün göstərmə,ey dibər,* |
| که ایمانه چو شیطانی بلورسنکم امین اولمز. | *Ki, imana çü şeytani bilirsən kim, əmin olmaz.* |
| چقر دلدن **سروری** سن خیال نقش دلداری، | *Çıxar dildən Sururi sən xiyali-nəqşi-dildari,* |
| بیلورسن دوزخی چونکم مقام حور عین اولمز. | *Bilirsən düzəxi çün kim, məqami huru eyn olmaz.* |

ولـه نظیرهٔ نجاتی

| | |
|---|---|
| مرض بودر تنه کم علت حبیب اولمز، | *Mərəz budur tənə kim, illət həbib olmaz,* |
| بوکا معالجه ایدن بکا طبیب اولمز. | *Buna mülicə edən, bana təbib olmaz.* |
| وصاله ایره مدم جد و جهد ایدپ وافر، | *Vüsalə irəmədim, cidu cəhd edib vafir,* |
| که دولت ادمه چوق سعی ایله نصیب اولمز. | *Ki, dövlət adəmə çox səy ilə nəsib olmaz.* |
| عجیب شکلومه هجرکده خلق اوکرندی، | *Əcib şəklümə , hicrində xaıq öyrəndi,* |
| غریبه انس اولیجق اولقدر غریب اولمز. | *Ğəribə üns olıcaq olqədər ğərib olmaz.* |
| دلا قو زلفینی سیر ایله قاشی محرابن، | *Dila qo zülfini, seyr eylə qaşı mihrabın,* |
| چو سجده کاهی مسلمانلرک صلیب اولمز. | *Çü sucdəgahi müsəlmanların səlib olamz.* |
| نه طک رقیب قریب اوله و **سروری** بعید، | *Nə tən rəqib qərib ola vu Sururi bəid,* |
| کلک چو خار اولور یاری عندلیب اولمز. | *Gülün çü xar olur yarı , əndəlib olmaz.* |

ولـه

| | |
|---|---|
| ارانوپ اول طبیب جان بولنمز، | *Aranıb ol təbibi-can bulunmaz,* |
| کلوپ بو دردمه درمان بولنمز. | *Gəlib , bu dərdimə dərman bulunmaz.* |
| نوله اخشم لمزسه بزده هر شب، | *Nola axşamlamazsa bizdə hər şəb,* |
| چو هر کیجه مه تابان بولنمز. | *Çün hər gecə məhi-taban bulunmaz.* |
| ویررسم جان تنم جانانی کورمز، | *Verərsəm canu tənim, cananı görməz,* |

| | |
|---|---|
| ولی جان ورمسم جانان بولنمز. | *Vəli can verməsəm canan bulunmaz.* |
| بو ایسه ظلم انی کم چشمک ایدر، | *Bu isə zülm anı kim, çeşmək eylər,* |
| جهانده بر یر ابادان بولنمز. | *Cahanda bir yer badan bulunmaz.* |
| چو دور حسن در فوت اتمه فرصت، | *Çü dövr hündür fovt etmə fürsət,* |
| دلا چونکم کچن دوران بولنمز. | *Dila çünkim, keçən dövran bulunmaz.* |
| نه سحر اولور بو کم مجروح ایدرسن، | *Nə səhər olur bu kim, məcruh edərsən,* |
| کورنمز تیرک و پیکان بولنمز. | *Görünməz tirin u peykan bulunmaz.* |
| نوله بریان دلمله اتسم ضیافت، | *Nila biryan dilimə etsən ziyafət,* |
| خیالک وش کوزل مهمان بولنمز. | *Xiyalın vəş gözəl , mehman bulunmaz.* |
| یوزه یوز اولیمز اول کنج یاره، | *Yüzə-yüz olamaz ol gənc yara,* |
| انوکچون کزلنوب در کان بولنمز. | *Anunçün gizlənibdir , kan bulunmaz.* |
| **سروری** اوقمه عشقنده کناری، | *Sururi oxuma eşqində kənri,* |
| چو عماندر اکا پایان بولنمز. | *Çü ummandır ana payan bulunmaz.* |

ولـه نظیرۀ خیالی

| | |
|---|---|
| صنکموز بیزی محبتدن همیشه خالیوز[1]، | *Sanmanız bizi möhəbbətdən həmişə xaliyüz,* |
| عاشقز اکا که وار یوزنده خط و خالی یوز. | *Aşiqiz ana ki, var üzündə xəttu xali yüz.* |
| بز غباره ایرجک باد فنا سرتاج ایدر، | *Biz ğubara iricək badi-fəna sərtac edər,* |
| کرچه بو کثرتده خلقک حالیا پامالیوز. | *Gərçi bu kesrətdə xalqən haliya pamalıyüz.* |
| دیمکوز اییله کوندز بو جهان اچره شفق[2]، | *Demənüz ayilə gündür bi cahan içrə şəfəq,* |
| بز دخی بو تکیه کاهک باش اچق ابدآلیوز. | *Biz daxi bu təkyəgahın başaçıq əbdaliyüz.* |
| کولکه‌دن کونه التمز کرچه زهر غم بزی، | *Gölgədən günə ilətməz , gərçi zəhri-ğəm bizi* |
| دشمنی اولدرمده اما جهان قتالیوز. | *Düşmanı öldürmədə, amma cahan qətallıyuz.* |
| قلبی ویرپ الورز اول خواجه دن اوزکه متاع، | *Qəlbi verib alırız ol xacədən özgə məta,* |
| اشبو بازارک **سروری** حیله کر دلالیوز. | *İşbu bazarın Sururi hiləgər dəllalıyuz.* |

ولـه نظیرۀ احمدپاشا

| | |
|---|---|
| یوز قزدره کر مهر و مه اکا عجب اولمز[3]، | *Üz qızdıra gər mehru məh ana əcəb olmaz,* |
| جرّار آشقلرده حیا و ادب اولمز. | *Cərrar aşıqlarda həya vu ədəb olmaz.* |

---

[1]. پروانه مجموعه سی : ۳۰۵۵

[2]. پروانه مجموعه سی: ایشیق

[3]. پروانه مجموعه سی : ۲۹٦٤ // نظمی مجموعه سی: ۱۹٤۵

هجر اولدره لی کوکلمی جسممده صفا یوق،
*Hicr ğldürəli könlümi, çismimdə səfa yox,*

بر اوده که میّت[1] اوله عیش و طرب اولمز.
*Bir evdəki, meyit ola eyşu tərəb olmaz.*

ادم کبی دل دانۀ خال استسه سومکه، سوکمه
*Adəm kibi dil daneyi-xal istəsə sevməgə,*

ای حور پری چهره ملکده غضب اولمز.
*Ey huri-pəri çehrə, mələkdə qəzəb olmaz.*

دیوانه دل امسه لبکی دیمه[2] سبب نه،
*Divanə del əmsə ləbini , deməsəbəb nə,*

عالمده چو عاقل لر اشی بی سبب اولمز.
*Aləmdə çü aqillər işi bi səbəb olmaz.*

چوق درد و بلا[3] چکدی محلکده **سروری**،
*Çox dərdu bəla çəkdi məhəllində Sururi,*

کرچه کشیه جنت ایچنده تعب اولمز.
*Gərçi kişiyə cənnət içində təəb olmaz.*

ولـه نظیرۀ احمدپاشا و نظامی

جانا دلرسک اوله سکا کر ثواب ناز[4]،
*Cana dilərsən ola sana gər səvabi-naz,*

عشاقه رحمت ایله ایدرکن عذاب ناز.
*Uşşaqa rəhmət ilə edərkən əzabi-naz.*

تک جورکک حسابنی اونتمه دوستم،
*Tək covrun hesabını unutma dostum,*

زیرا جزا کوننده صورلمز حساب ناز.
*Zira cəza günündə sorulmaz hesabi-naz.*

استاد فن شیوه در اول علمی[5] چوق کوزل،
*Ustadi-fənni-şivədir ol, elmi çox gözəl,*

تالیف ایلر ایسه اولور بیک کتاب ناز[6].
*Təlif eylər isə, olur bin kitabi-naz.*

تاثیری وار جفا کبی نازکده سرورا،
*Təsiri var cəfa kibi nazında sərvəra,*

عشاق کوکلی طکمی اولورسه خراب ناز[7].
*Uşşaqi könlümi tənmi olursa xərabi-naz..*

کوسترمیوب یوزن نیجه یوزدن طوغر بکا،
*Göstərməyib üzün, necə üzdən doğar bana,*

دیرسم عجبمدر اکه بن آفتاب ناز[8].
*Dirsəm əcəbdir ana bən afitabi-naz.*

افسون ایدم دیو کیجه حالومی سویلدم،
*Əfsun edəm deyü, gecə halımı söylədim,*

افسانه کلدی دلبره خوب اتدی خواب ناز.
*Əfsanə gəldi dilbərə, xub etdi xabi-naz.*

فتح کلام ایلیجک ناز کشف اولور،
*Fəthi-kəlam eyləyəcək naz kəşf olur,*

دیرسم عجبمیدر دهن یاره باب ناز.
*Dirsəm əcəbmidir dəhəni-yarə babi-naz.*

ناز اتدکنجه اغلدغم جوجه کلمیوب،
*Naz etdigincə ağladığım covca gəlməyib,*

سائل بشومه ویرمدی الا جواب ناز[1].
*Sail başıma vermədi illa , cavabi-naz.*

---

[1]. پروانه مجموعه سی: منت // نظمی مجموعه سی: منت
[2]. پروانه مجموعه سی: باری
[3]. پروانه مجموعه سی: درلو بلا // نظمی مجموعه سی: درلو بلا
[4]. پروانه مجموعه سی : ۲۹٤۱ // نظمی مجموعه سی: ۱۹۸۰
[5]. نظمی مجموعه سی: جوری
[6]. پروانه مجموعه سی: بو بیت یوخدور
[7]. پروانه مجموعه سی: بو بیت یوخدور // نظمی مجموعه سی: خواب ناز
[8]. پروانه مجموعه سی: بو بیت یوخدور

| | |
|---|---|
| اولدی غدا **سروری** یه چون ناز نازنین، | *Oldı qida Sururiyə çün nazi-nazənin,* |
| باشلر نیازه ایلسه ناز و عتابن آز. | *Başlar niyaza, eyləsə nazu itabın az.* |

ولـه

| | |
|---|---|
| غیره لطف و مهر ایدپ باکه ایدر جوریله ناز[۲]، | *Qeyrə lütfu mehr edib, bana edər covrilə naz,* |
| بنده سینه غیرلردن ویرمک استر امتیاز. | *Bəndəsinə qeylərdən vermək istər imtiyaz.* |
| باکه تیغ اوردقده سن دشمن حسددن اولدی فوت، | *Bana tiğ vurduqda sən, düşman həsəddən oldı fovt,* |
| یرده یتدقجه او حق ویرسون سکا عمر دراز. | *Yerdə yatdıqca , o haqq versin sana ömri-diraz.* |
| اغزمی طوت اغز اچوب بوسه عهد ایله ینه، | *Ağzımı tut, ağız açıb busə əhd eylə yinə,* |
| یوخسه اغزک اوپدکم دیرم اچیلور کزلو راز[۳]. | *Yoxsa ağzım öpdügüm , dirəm açılır gizli raz.* |
| دیلده صبرم یوق بلورسنک ارتوررسن جورنی، | *Dildə səbrim yox, bilirsən artırırsan covrunı,* |
| باش آچوق دیوانه اولورم آچیلور کزلو راز[۴]. | *Baş-açıq , divanə oluram, açılır gizli raz.* |
| بن ایقده قلمشی زلفکده بر دار ایلدک، | *Bən ayaqda qalmışı zülfündə bər dar eylədin,* |
| همت عالی قلوپ اتدک قلوکی سرفراز. | *Himməti-ali qılıb, etdin qulunı sərfəraz.* |
| اتمسون اهل نیازه نازی از اول نازنین، | *Etməsin əhli-niyaza nazi az, ol nazənin,* |
| ای **سروری** وارپ اکا ایده لم چوق چوق نیاز[۵]. | *Ey Sururi varıb ana edəlim çox-çox niyaz.* |

ولـه

| | |
|---|---|
| بر کوزل معجونجینک حیرانی اولدی کوکلمز، | *Bir gözəlməcuncinin herani oldı könlümüz,* |
| کاه حیرانی کهی سکرانی اولدی کوکلمز. | *Gah heyrani, gəhi səkrani oldı könlümüz.* |
| وارمز ایکن اهل عرضم دییو تحت القلعه یه، | *Varmaz ikən, əhli-ərzəm deyü, təhtul qalaya,* |
| کوره لی انده سنی مهمانی اولدی کوکلمز. | *Görəli anda səni, mehmani oldı könlümüz.* |
| حقه اغزندن اموپ اتدی وصالی فکرنی، | *Hoqqa ağzından əmib, etdi vusali fikrini,* |
| بنکله ییدی اقلیمک سلطانی اولدی کوکلمز. | *Bənlə yeddi iqlimin sultani oldı könlümüz.* |
| طکمی کور بنکی و کچکین شویله تریاکی اولم، | *Tənmi gör bəngi vu keçkin şöylə tiryaki olam,* |
| چونکه اول معجونجینک کریانی اولدی کوکلمز. | *Çünki, ol məcuncinin giryani oldı könlümüz.* |
| حقه اغزینی کوریجک ییمدین دوتدی مکر، | *Hoqqa ağzını göricək yeymədən tutdı məgər,* |
| قرشوسنده صورتی بی جانی اولدی کوکلمز. | *Qarşısında surəti-bicani oldı könlümüz.* |

---

۱. پروانه مجموعه سی: بو بیت یوخدور
۲. پروانه مجموعه سی : ۲۸۸٤ // ۱۷۹۳
۳. پروانه مجموعه سی: بو بیت یوخدور
٤. بو بیت پروانه مجموعه سیندن علاوه اولونوبدور.// نظمی مجموعه سینده یوخدور
٥. پروانه مجموعه سی: ای دهانی حقه سن آتله ایدرسن کرچه بند//بو سروری و داخی عشق اهل دیرلر حقه باز

| | |
|---|---|
| اغزک اسراری بتر دلده شها حیرآنلره، | *Ağızın əsrari bitər dildə şəha heyranlara,* |
| وار ایسه اسرارکک بوستانی اولدی کوکلمز. | *Var isə əsrarının bustanı oldı könlümüz.* |
| اچلی معجون دکانن قپندی میکده، | *Açalı məcun dukanın , qapandı meykədə,* |
| می یرینه شمدی معجون کانی اولدی کوکلمز. | *Mey yerinə şimdi məcun kanı oldı könlümüz.* |
| بن ییدم غالب سنی دوتدی کوکل شاشدک قتی، | *Bən yedim, qalib səni tutdı könül, şaşdın qatı,* |
| طکمی دیرسم ایللرک سیرانی اولدی کوکلمز. | *Tənmi dirsən, eylərək seyranı oldı könlümüz.* |
| دلده یاقوتی مفرحدر **سروری** چون لبی، | *Dildə yaqutı müfərrəhdir Sururi çün ləbi,* |
| جوهری معجونلرک دکانی اولدی کوکلمز. | *Covhəri məcunların dukanı oldı könlümüz.* |

ولـه

| | |
|---|---|
| بزمله زاهد یابس بلشمز، | *Bəzmilə zahidi-yabəs bilişməz,* |
| که تریاکی ایله سرخوش الشمز. | *Ki, tiryaki ilə sərxoş oluşmaz.* |
| اوقکدن نیجه مجروح اولمسون دل، | *Oxundan necə məcruh olmasın dil,* |
| همان اوغرر کچر تنده ایلشمز. | *Haman uğrar, keçər təndə iləşməz* |
| قچن باد صبا اتسه صوقلق، | *Qaçan badi-səba etsə sovuqluq,* |
| اچلمز غنچه لر کل لر کولشمز. | *Açılmaz ğönçələr, güllər güləşməz.* |
| کلک کرچه اچقدر یوزی اما، | *Gülün gərçi açıqdır üzi, amma,* |
| ایدپ ال اونین یلله یولشمز. | *Edib al , oynanan yellə yollaşmaz.* |
| **سروری** نوله چقمزسه سکا یار، | *Surui nola çıxmzsa sana yar,* |
| اکابر چونکه هر شخصه بولشمز. | *Əkabir çünki hər şəxsə bulaşmaz.* |

ولـه نظیرهٔ نجاتی

| | |
|---|---|
| پایکه باش قومه در دلده بزم نیتمز[1]، | *Payına baş qomadır dildə bizim niyyətimiz,* |
| ایره رز پایکه باشده وارسه دولتمز. | *İrəriz payına, başda varsa dövlətimiz.* |
| خاک پایکله اکرچه کوزم اچدی کحّال، | *Xaki-payınla əgərçi gözüm açdı kəhhal,* |
| ایغک طپرغنه در ینه هپ منتمز. | *Ayağın toprağınadır həp minnətimiz.* |
| حرمتی هر کیشی نک اولور النده دیرلر، | *Hörməti hər kişinin olur əlində dirlər,* |
| ساقیا الده ایکن صاقنلم حرمتمز. | *Saqiya əldə ikən saqınalım hörmətimiz.* |
| بوزدلر صورت مجنونی نکارا قویوب، قزیوب | *Bozdular surəti Məcnuni nigara qızıyub,* |
| صفحهٔ عالمه نقش اوللیدن صورتمز. | *Səfhəyi-aləmə nəqş olalıdn surətimiz.* |

[1]. نظمی مجموعه سی: ۱۸۷۲

| | |
|---|---|
| غم دلداری یمزسم اولورم قو بنی سن، | *Ğəmi-dildari yeməzsəm, ölürəm qo bəni sən,* |
| چون طبیبا سنک الکده دکل صحتمز. | *Çün təbiba sənin əlində dəgil səhhətimiz.* |
| لبی حیرانیم اول مست می ناب صنور، | *Ləbi heyranıyam , ol məsti-meyi-nab sanır,* |
| اکا معلوم دکل اه که کیفیتمیز. | *Ana məlum dəgil ah ki, keyfiyyətimiz.* |
| شکلمی نقش ایده مز حیرت الور نقاشی، | *Şəklimi nəqş edəməz, heyrət olur nəqqaşı,* |
| اول نکاره چو **سروری** کوره بو حیرتمز. | *Ol nigara çü asururi görə bu heyrətimiz.* |

ولـه

| | |
|---|---|
| دل یانسه نولا اول کوزی مستانه کورنمز، | *Ol yansa nola, ol gözi məstnə görünməz,* |
| جان چقسه عجبمی کوزه جانانه کورنمز[1]. | *Can çıxsa əcəbmi, gözə canana görünməz.* |
| ای باد صچندن نه خبر ویردک انک کم، | *Ey bad, saçından nə xəbər verdin anın kim,* |
| یانمده بنم بو دل دیوانه کورنمز. | *Yanımda bənim bu dili-divanə görünməz.* |
| خشم اتدی چون اول شاه دلا کوینه وارمه[2]، | *Xəşm etdi çün ol şah , dila kuyinə varma,* |
| مغضوب اولان بنده چو[3] سلطانه کورنمز. | *Məğzub olan bəndə çü sultana görünməz.* |
| شانه صچوکک باکه نشانن ویره دیردم، | *Şanə saçının bana nişanın verə dirdim,* |
| دوشدی ایچنه باتدی انک شانه کورنمز. | *Düşdi içinə, batdı anın şanə görünməz.* |
| باخسم یوزنه مانع اولور یای یارب، | *Baxsam üzünə, mane olur yay, ya rəb,* |
| انجم نه سببدن مه تابانه کورنمز[4]. | *Əncum nə səbəbdən məhi-tabana görünməz.* |
| چون شانه قلور زلفنی دیوانه کوکل لر، | *Çün şanə qılır zülfüni divanə könüllər,* |
| اول دکلو دوشرلر که سری شانۀ کورنمز[5]. | *Ol dənlü düşərlər ki, səri-şanə görünməz.* |
| هردم کوره مز اول لب رنکینی **سروری**[6]، | *Hər dəm görəməz ol ləbi-rəngini Sururi,* |
| کم دکمه ده جان صورتی انسانه کورنمز. | *Kim, dəgmədə can surəti insana görünməz.* |

ولـه

| | |
|---|---|
| یار دیمش شوکا کم جور و جفالر ایده رز، | *Yar demiş şuna kim, covru cəfalər edəriz,* |
| قتلنورسه صوک اوجی مهر و وفالر ایده رز. | *Qatlanırsa son ucı, mehru vəfalar edəriz.* |
| اکدغکجه سوکه درسن بزی ای شیرین لب، | *Andığca sona dersən bizi, ey şirin ləb,* |
| کرچه بز ساکه دعالرله ثنالر ایده رز. | *Gərçi biz sana dualar, sənalar edəriz.* |

---

[1]. واتیکان نوسخه سی: فریاد که اول کوزلری مستانه کورنمز//جان یاندی فراق اودنه جانانه کورنمز
[2]. واتیکان نوسخه سی: اول ماه که کوکل کوینه کلمه
[3]. واتیکان نوسخه سی: کم قول که سورلدی دخی
[4]. کا. نوسخه سینده بو بیت یوخدور
[5]. کا. نوسخه سینده بو بیت یوخدور
[6]. واتیکان نوسخه سی: آندن کورنمز اول رخ زیبایه سروری

| | |
|---|---|
| ذوق و شوق اهلی دکل صنمه بزی ای صوفی، | *Zövqu şövq əhli dəgil, sanma bizi ,ey sufi,* |
| می صافی ایله بز ذوق و صفالر ایده رز. | *Meyi-safi ilə biz zövqu səfalar edəriz.* |
| ددی جانوکی الوپ دیشلدورز لبلرمز، | *Dedi canını alıb, dişlədiriz ləblərimiz,* |
| بز سنک جانکه بر نیچه خبر آلر ایده رز. | *Biz sənin canına bir neçə xəbər alar edəriz.* |
| کر صوررلرسه **سروری** طرفندن اخبار، | *Gər sorarlarsa Sururi tərəfindən əxbar,* |
| ای صبا جملهٔ یارانه دعالر ایده رز. | *Ey səba cümıəyi-yarana dualar edəriz.* |

ولـه

| | |
|---|---|
| کاکلک فکرنده اشکم کتمز ای مه اه سز، | *Kakilin fikrində əşkim getməz, ey mah ahsız,* |
| طفل اولان چقمز کیجه چون طشریه همراه سز. | *Tifl olan çıxmaz gecə çün tışraya həmrahsız.* |
| ای کوزللر بز سنی کوردکجه حقدن کشف اولور، | *Ey gözəllər, biz səni gördükcə həqdən kəşf olur,* |
| شویله بکزر کم کوزه ایینهٔ اللـه سز. | *Şöylə bənzər kim, gözə ayinəyi allahsız.* |
| قاشنی کوستردکی شب نوله ستر اتسه یوزن، | *Qaşını göstədigi şəb, nola sətr etsə üzün,* |
| ای باشنده ای کوکل اولور کیجه چون ماه سز. | *Ay başında, ey könül olur gecə çün mahsız.* |
| پادشاهم سندن ایرو کر صوررسک کوکلمی، | *Padişahım səndən ayrı gər sorarsın könlümi,* |
| بر خرابه مملکت در کم قلوپدر شاه سز. | *Bir xaraba məmləkətdir kim, qalıbdır şahsız.* |
| ای **سروری** کر کریه اولسه رقیب اولمز عجب، | *Ey Sururi gər giruə olsa rəqib, olmaz əcəb,* |
| چونکه اقرار ایلمز عشق اهلنه اکراه سز. | *Çünki iqrar eyləməz eşq əhlinə ikrahsız.* |

ولـه نظیرهٔ نهالی

| | |
|---|---|
| زلفی زنجیری اوللدن بوینمزده قیدمز، | *Zülfi xənciri olalıdan boynumuzda qeydimiz,* |
| عالم اطلاقه دوشدی قلجه یوقدر قیدمز. | *Aləmi-itlaqa düşdi, qılca yoxdur qeydimiz.* |
| اول کوزی اهو شکاریچون کرکمز سک رقیب، | *Ol gözi ahu şikariçün gərəkməz sək rəqib,* |
| اوزکه شهبازز بزم کلب ایله اولمز صیدمز. | *Özgə şəhbazız, bizim kəlb ilə olmaz seydimiz.* |
| دام زلفک اولدرر عشاقی دیدم دیدی یار، | *Dami-zülfün öldürür uşşaqqi,dedim, dedi yar,* |
| نیلیم بن جان ویرر اکا دولاشوب صیدمز. | *Neyləyim bən, can verir anan dolaşıb seydimiz.* |
| ای علی بالم ابوبکر و عمر عثمان حقی، | *Ey Əli balım,Əbubəkru Ömər Osman həqi,* |
| سودکم سن سن قوشوسن غیری عمرو زیدمز. | *Sevdigim sənsən qoşusan qeyri Əmru Zeydimiz.* |
| حلقهٔ ذکره اکرچه کرمزز صوفی صفت، | *Hələqəyi-zikrə əgərçi girməziz sufi-sifət,* |
| خلقه یوقدر حق بیلور هرکز **سروری** کیدمز. | *Xalqa yoxdur , həqq bilir həgiz Sururi keydimiz.* |

ولــه[۱]

| | |
|---|---|
| صوفی که کیدر مسجده میخانیه کلمز، | *Sufi ki, gedər məscidə, meyxaya gəlməz,* |
| بر خانیه وارر نیه بر خانیه کلمز. | *Bir xanəyə varır, niyə bir xanəyə gəlməz.* |
| اول کیشی که مستغرق ایدر نورده[۲] جمعی، | *Ol kişi ki, müstəğrəq edər nurda cəmi,* |
| یارب نه ایچون یازوغی پروانیه کلمز. | *Yarəb, nə üçün yazığı pərvanəyə gəlməz.* |
| سینمدن اوتب اوخی کوزم یاشنه کلمز. | *Sinəmdən ötüb oxı, gözüm yaşına gəlməz,* |
| بر قوش که بغر پاره سی بر دانیه کلمز. | *Bir quş ki, bağır parəsi, bir danəyə gəlməz.* |
| کوکلم اوی هم ویرانه اولورسه جفادن[۳]، | *Könlüm evi həm viranə olursa cəfadan,* |
| اول ترک پری چهره بو ویرانیه کلمز. | *Ol Türk, pəriçehrə bu viranəyə gəlməz.* |
| زی عشق جبلّی که طفلکده دخی هم، | *Zi eşq cəbbili ki, tiflində daxi həm,* |
| مجنون رخ زیبا کوزه در آینه کلمز[۴]. | *Məcnun ruxi-ziba gözədir ayinə gəlməz.* |
| مشاطهٔ کل اول سنبل رعنایه دولشسه، | *Məşatə gül ol sünbüli rənaya dolaşsa,* |
| کر رشتهٔ[۵] جان نازک اولور شانیه کلمز. | *Gər rişteyi-can nazikolur, şanəyə gəlməz.* |
| کل کتمه دخی انجمن وعظه **سروری**، | *Gəl getmə daxi əncuməni vəəzə Sururi,* |
| کم عاشق اولن صحبت افسانیه کلمز. | *Kim, aşiq olan söhbətu əfsanəyə gəlməz.* |

ولــه[۶]

| | |
|---|---|
| بز ازلدن تا ابد میدانه[۷] کلمشلرده نوز، | *Biz əzəldən ta əbəd meydana gəlmişlərdənüz,* |
| شاه مردان عشقنه مردانه کلمشلرده نوز. | *Şahi-Mərdan eşqinə,mərdanə gəlmişlərdənüz.* |
| قلمغه حقدن کلام اللـه ناطق شرحنی، | *Qılmağahəqqdən kəlamullahi-natiq şərhini,* |
| روح قدسز کم رخی انسانه کلمشلرده نوز. | *Ruhi-qudsiz kim, ruxi-insana gəlmişlərdənüz.* |
| کایناتی صورتی رحمانه تبدیل ایلروز، | *Kayinati, surəti rəhmana təbdil eylərüz,* |
| کم بیان علم القرانه کلمشلرده نوز. | *Kim, bəyani ilmi-Quranə gəlmişlərdənüz.* |
| غیبت مطلق دن تماشای رخی زیبا ایچون، | *Qeybəti mütləqdən təmaşayi ruxi ziba üçün,* |
| بز شهادت ملکنه سیرانه کلمشلرده نوز. | *Biz şəhadət mülkünə seydanına gəlmişlərdənüz.* |
| بر معنبر طره ننک کفرینه آمنّا دیوب، | *Bir müənbər türrənin küfrnə aməna deyib,* |
| حقه تسلیم اولمشوز ایمانه کلمشلرده نوز. | *Həqqə təslim  olmuşuz, imana gəlmişlərdənüz.* |

---

۱. باشقا منبعلرده یوخدور// مجلس و واتیکان ص. ٦٤-٦٥// س. نوسخه سی ص. ۲۱
۲. مجلس مجموعه سی: یوزمه
۳. مجلس مجموعه سی: کوکلم اوی ویرانه هم الورسه وفادن
٤. مجلس مجموعه سی: بو بیت یوخدور
٥. مجلس مجموعه سی: کم شیشهٔ جان
٦. بو غزل باشقا نوسخه لرده یوخدور// واتیکان نوسخه سیندن آلینیبدیر. ص. ٦٠-٦١//س. نوسخه سی ص. ۲٥
٧. س. : مستانه

ساقی باقی الندن مست اولوب ایچمکدیوز... — *Saqi-baqi əlindən məst olub içməkdəyız,*
نعرهٔ مستان اورپ مستانه کلمشلرده نوز. — *Nərəyi-məstan vurub, məstanə gəlmişlərdənüz.*
ای **سروری** عید اکبردر جمالی دلبرک، — *Ey Sururi eydi-əkbərdir , camalı dilbərin,*
بز بو عید اکبره[1] قربانه کلمشلرده نوز. — *Biz bi eydi-əkbərə, qurbana gəlmi.lədənüz.*

ولـه[2]

ای خطک خضر و دهانک چشمهٔ حیوانمز، — *Ey xəttin Xizru dəhanın çeşmeyi-heyvanımız,*
عارضک عرش و یکاغک صورتی رحمانمز. — *Arizin ərşu yanağın surəti rəhmanımız.*
مصحف حسنک بیانیدر ازلدن تا ابد، — *Müshəfi-hüsnün bəyanidir əzəldən ta əbəd,*
لوحمز توراتیمز انجیلمز فرقانمز. — *Lövhumuz, Tövratımı, İncilimiz, Furqanımız,*
لوح محفوظ الهی در جمالک صفحه سی، — *Lövhi-məhfuzi-ilahidir cmalın səfhəsi,*
اوش کلام اللـه ناطق حجت برهانمز. — *Uş kəlamullahi-natiq, hüccətu burhanımız.*
بخمیوب کون و مکانه کوزلرز دیدارکی، — *Baxmarız kuvnu məkana, gözləriz didarını,*
روح قدسز عالم اعلاده در سیرانمز. — *Ruhi qudsuz, aləmi-əladadır seyranımız.*
عنبرافشان سنبلک کفرندن اوزکه ای صنم، — *Ənbər əfşan sünbülün küfrindən özgə, ey sənəm,*
کافری عشقز اولورسه دینمز ایمانمز. — *Kafəri eşqiz, olursa dinimiz, imanımız.*
احسن تقویمه رحمان صورتی دیمز حسود[3]، — *Əhsəni-təqvimə rəhman surəti deməz həsud,*
لعنت اول ملعونه کم اولدر بزم شیطانمز. — *Lənət ol məluna kim, oldur bizim şeytanımız.*
ای **سروری** اول لبی معجز کلامک نظمنه، — *Ey Sururi, ol ləbi möciz kəlamın nəzminə,*
لشکر ارواح اولور هر دم بزم مهمانمز. — *Ləşkəri-ərvah olur hər dəm bizim mehmanımız.*

ولـه[4]

زلفنک کفریله هر کم عهد و پیمان ایلمز، — *Zülfünün küfru ilə hər kim, əhdu peyman eyləməz,*
تا ابد کافر قالور سودای ایمان ایلمز. — *Ta əbəd kafir qalır, sevdayi iman eyləməz.*
کوزلرم سودای زلفکله نوله قان اغلسه، — *Gözlərim sevdayi-zülfünlə nola qan ağlasa,*
کیمسهٔ بخت سیه عالمده خندان ایلمز. — *Kimsəyi bəxti-siyəh aləmdə xəndan eyləməz.*
دیدی اغزک سرّنی دلدن انکچون منع ایدر، — *Dedi ağzın sirrini dildən anunçün mən edər,*
کم جواهر معدنی ایوانه پنهان ایلمز. — *Kim, cəvahir mədəni , ivanə pünhan eyləməz.*
دل یخب جان الدی مندن غمزهٔ مستک سنک، — *Dil yıxıb, can aldı məndən ğəzəyi-məstin sənin,*

---

[1]. س. : بز بو عید خود ایدوب
[2]. بو غزل باشقا نوسخه لرده یوخدور// واتیکان نوسخه سیندن آلینیبدیر.ص. ٦٢-٦٣// س. ص.٢٣
[3]. س. فقیه
[4]. بو غزل باشقا نوسخه لرده یوخدور// واتیکان نوسخه سیندن آلینیبدیر. ص. ٦٣-٦٤// س. نوسخه سی ص. ٢١

| | |
|---|---|
| *Dostum, düşman daxi bu rəsmə talan eyləməz.* | دوستم دشمن دخی بو رسمه تالان ایلمز. |
| *Müddəi yolunda can verməz, deyərmiş aşiqə,* | مدّعی یولکده جان ویرمز دیریمش عاشقه، |
| *Dini olan kişi, nahəq yerə böhtan eyləməz.* | دینی اولن کیشی ناحق ییره بهتان ایلمز. |
| *Bana mehr eylər deyü, laf etmişəm lütf eylə kim,* | باکه مهر ایلر دیو لاف اتمشم لطف ایله کم، |
| *Yara gerçək yar olan yarını yalan eyləməz.* | یاره کرچک یار اولن یارینی یالان ایلمز. |
| *Ey Sururi, ol sənəmdən əhdu peyman istəmə,* | ای **سروری** اول صنمدن[1] عهد و پیمان استمه، |
| *Kim, pəridir, adəm ilə əhdu peyman eyləməz.* | کم پری در آدمیله عهدو پیمان ایلمز. |

ولـه[2]

| | |
|---|---|
| *Kakilin fikrində gözdən yaş getməz absız,* | کاکلک فکرنده کوزدن یاش کتمز آبسز، |
| *Tiflvəş kim, gecə evdən çıxamaz həmrahsız.* | طفل وش کم کیجه اودن چیخه مز همراه سز. |
| *Sünbülün mehri-ruxunı necə mən eylər desəm,* | سنبلک مهر رخکنی نیجه منع ایلر دسم، |
| *Ardır , der ay başında gecə olmaq yarsız.* | عاردر دیر آی باشنده کجه اولمق یارسز. |
| *Ğəm sipahındn mən könüldə xəyalından cuda,* | غم سپاهندن منع کوککده خیالکنده جدا، |
| *Bir qılıl mülkətdə kim, qalibdır təmənasız.* | بر غلل ملکت ده کم قالب در تمناسز. |
| *Hüsnünün mahiyyətin bilməkdə heyrandır aqlımız,* | حسنکون ماهیتن بلمکده حیراندر عقلمز، |
| *Ey gözəllər, siz məgər ayineyi allahsız.* | ای کوزللر سز مکر آیینهٔ اللـه سز. |
| *Ey Sururi aşiq oldur kim, canalı yarına,* | ای **سروری** عاشق اولدر کم جنالی یارنه، |
| *Səcdə eylər, surəti rəhman görüb, ikrahsız.* | سجده ایلر صورتی رحمان کورب اکراه سز. |

ولـه[3]

| | |
|---|---|
| *Fəzli-həqdən kaşifi-kəncineyi-əşya biziz.* | فضل حقدن کاشف کنجینهٔ اشیا بزز، |
| *Aləmi-təlim elmu əlləmi-əsma biziz.* | عالم تعلیم علم علّم الاسما بزز. |
| *Yol bulub həqdən ələlərş ustsvanın şərhini,* | یول بولوب حقدن علی العرش استوانک شرحنی، |
| *Surəti-rəhmana ayırdan adəmi-məna biziz.* | صورت رحمانه اییردک ادم معنا بزز. |
| *Bizdədir çün nameyi-min əndəhu ummulkitab,* | بزده در چون نامهٔ من عنده ام الکتاب، |
| *Sacidi Kəəbə, imami-məscidi Əqsa biziz.* | ساجد کعبه امام مسجد اقصا بزز. |
| *Yəni tədvili-kəlamullahi-asimani bizdədir,* | یعنی تدویل کلام آسمانی بزده در، |
| *Hüccəti-qaim ki, eşitdin biziz, İsa biziz.* | حجت القائم که اشتدک بزز عیسا بزز. |

---

[1]. س. پریدن
[2]. باشقا نوسخه لرده یوخدور// واتیکان نوسخه سیندن آلینیبدیر. ص. ٦٦-٦٧
[3]. باشقا نوسخه لرده یوخدور// سو نوسخه سی ص. ۲۱

| | |
|---|---|
| لیلۀ المعراجه بر زلف معنبردن ایروب، | *Leylətul-Meraca bir zülfi-müənbərdən irib,* |
| واقف اسرار سبحان الذی اسرا بزز. | *Vaqifi-əsrari-sübhan ələzi, əsra biziz.* |
| شعلۀ انی انااللـه ایله یاندوق شعله تک، | *Şöleyi-eni ənəllah ilə yandıq şölə tək,* |
| وادی ایمن مقام اولدی بزه موسی بزز. | *Vadiyi-imən məqam oldı bizə, Musa biziz.* |
| ای **سروری** فضل یزدانک بیاننده بوکون، | *Ey Sururi, fəzli-yəzdanın bəyanıdır bugün,* |
| اسم اعظم وجهمزدر جامع اشیا بزز. | *İsmi-əzəm vəchimizdir, vamei-əşya biziz.* |

**قافیۀ السین**- عدد (۴)- ۵

ولـه نظیرۀ احمدپاشا و نجاتی

| | |
|---|---|
| اصدک ای جان کوکلمی اتدک دیو زلفم هوس [۱]، | *Asdın ey can könlümi, etdin deyü zülfüm həvəs,* |
| چون کناهی قلجه یوق کل اولمدن ایپنی کس. | *Çün günahı qılca yox gəl ölmədən ipini kəs.* |
| چاشتی بلمک [۲] هوآسنده اوچردی کرچکم، | *Çaşını belmək havasında uçardı gərçi kim,* |
| لبلرک قندینی صوردم اکسه سن قاشر [۳] مکس. | *Ləblərin qəndini sordum, ənsəsin qaşar məgəs.* |
| اغزمی طوت لطفله دکدرمک استرسک بنی، | *Ağzımı tut lütfilə, dindirmək istərsən bəmi,* |
| یوخسه یوقدر اختیارم ناله ده همچون جرس. | *Yoxca yoxdur ixtiyarım nalədə həmçün cərəs.* |
| نای زنلر سرّله دیدکچه نایه [۴] دردمی، | *Nayzənlər sirr ilə dedikcə nayə dərdimi,* |
| نای فریاد و فغان ایلر بنمچون هم [۵] نفس. | *Nay fəryadu fəğan eylər, bənimçün həm nəfəs.* |
| اوغردقچه زلفنه بوین کتورسن بو یکا، | *Uğradığca xülfünə buyin gətirsin bu yana,* |
| بو دکلمیدر صبادن ای **سروری** ملتمس. | *Bu dəgilmidir səbadan, ey Sururi mültəməs.* |

ولـه نظیرۀ دیکر

| | |
|---|---|
| مرغ جانه کرچه بو جسم ضعیف اولمش قفس [۶]، | *Murği cana gərçi bu çism zəif olmuş qəfəs,* |
| لیک کویک کلشنی پروازنه قیلور هوس. | *Leyk kuyin gülşəni pərvazına qılır həvəs.* |
| اویخو اویتمز بکا دایم [۷] خیال خال دوست، | *Uyxu oyatmaz bana daim xəyali-xli-dost,* |
| خواب کلمز چشمه [۸] زیرا قنده چوغ اولسه مکس. | *Xab gəkməz çeşmə, zira qanda çox olsa məgəs.* |
| یلورپ بر بوسه عهدن ایلکل باکه دیدم، | *Yalvarıb bir busə əhdin eyləgil bana dedim,* |

[۱]. پروانه مجموعه سی : ۳۳۲۹ // نظمی مجموعه سی: ۲۰۱٤
[۲]. پروانه مجموعه سی: باشنی یلمک // نظمی مجموعه سی: چاشنی یلمک
[۳]. نظمی مجموعه سی: اوشر
[٤]. پروانه مجموعه سی: یاره
[٥]. پروانه مجموعه سی: هر // نظمی مجموعه سی: هر
[٦]. پروانه مجموعه سی : ۳۳٤٦ // نظمی مجموعه سی: ۲۰۱۳
[۷]. پروانه مجموعه سی: هرشب // نظمی مجموعه سی: هرشب
[۸]. پروانه مجموعه سی: کوزه

دیدی ناز ایدیپ ایکن چوق سویلدک سن اندی بس. *Dedi naz edüb inən, çox söylədin sən, indi bəs.*
غمزه سندن خوف ایدیپ دل ایلمز افغان[۱] و زار، *Ğəmzəsindən xuf edib, dil eyləməz əfğanu zar,*
کاربانی دویرر زیرا حرامی یه جرس. *Karbanı duyarar zira həramiyə cərəs.*
کر ک کوه عشق ایدی اشبو **سروری** دلبرا، *Gər ki, kihi-eşq idi işbu Sururi dilbəra,*
لیک سن یوسف جماله بولمدی هیچ دست رس. *Leyk sən Yusif cmalə bulmadı hiç dəstrəs.*

ولـه

اله شادی و هجراندن بکا یاس، *Ala şadivu hicrandan bana yas,*
انوکچون حالمی بلمز بنم ناس. *Anunçün halımı bilməz bənim nas.*
ایا شاه جهان محمود سن سن، *Əya şahi-cahan Mahmud sənsən,*
ایدرسک خاص اولورم بنده ایاس. *Edərsən xas oluram bən də Ayas.*
صدا ویرر فلک بوش اولدوغیچون، *Sid verir fələk boş olduğuçün,*
که چکرامز شها طولو اولان طاس. *Ki, çıkramaz şəha dolu olan tas.*
نمدپوش اولوپ اچمه هر یوزه یوز، *Nəməd puş olub, açma hər üzə üz,*
که تا مرات وش دوتمایه سن پاس. *Ki, ta meatvəş tutmayasan pas.*
**سروری** بحر اشکه اولمدین غرق، *Sururi bəhri-əşkə olmadan ğərq,*
مدد خضر اول یتش سن اکه الیاس. *Mədəd Xizr ol, yetişsən ana İlyas.*

ولـه[۲]

داغ عشقکدن کوزم کرپک لرمله هر نفس، *Daği-eşqindən gözüm, kirpiklərimlə hər nəfəs,*
بر اوجاقدر کم یانوب دورنده قالور خار خس. *Bir ocaqdır kim, yanıb dövründə qalır xaru xəs.*
لعل شیرینکده خال و خط دکل بلکم قونوب، *Ləli şirində xalu xətt dəgil, bil kim, qonub,*
شکری نابه زمرددن قنات کرمش مکس. *Şəkəri-naba zümürddən qanat girmiş məgəs.*
آه آتلان کم هلال عیدله کون شعله سی، *Ah atlan kim, hilal eydilə gün şöləsi,*
اولسون ایتک چون مرصع طوقله زرین مرس. *Olsun etdin çün mürəssə tovqilə zərrin mərəs.*
کوزلرم یاشین تنی خاکی نجون منع ایلسون، *Gözlərim yaşın təni-xaki neçün mən eyləsin,*
بند اولری بر آوج طپراغله نیل و ارس. *Bənd oları bir avuc toprağ ilə Nilu Ərəs.*
قطرهٔ اشکم که همرنک اولمغ استرسک لعلکه، *Qətreyi-əşkim ki,həmrəg olmaq istərsən ləlinə,*
طفله بکزر کم قبایی قرمزی ایلر هوس. *Tiflə bənzər kim, qəbayi- qırmızı eylər həvəs.*

---

۱. پروانه مجموعه سی: فریاد // نظمی مجموعه سی: فریاد
۲. بو غزل باشقا منبع لرده یوخدور// واتیکان نوسخه سیندن آلینیبدیر. ص. ٦٩-٧٠// تخلص بیت یوخدور.

ولـه[۱]

ای کوکل مرغی جهان جاودانی قیل هوس، *Ey könül murği cahani-cavdani qıl həvəs,*
که اوله سن عنقای قاف قربه دایم هم نفس. *Ki, olasan ənqayi qafi-qurbə daim həm nəfəs.*
جهد ایدب اماره نفسه اویمه کم آخر سنی، *Cəhd edib əmarə nəfsə uyma kim, axır sını,*
شاهباز آشیانی عرش ایکن ایلر مکس. *Şahbazı aşiyani-ərş ikən eylər məgəs.*
خاکدانی عالم سفلده پابند اولمه کم، *Xakdani aləmi-səflada pabənd olma kim,*
عندلیب کلشنی اعلایه یارشمز قفس. *Əndəlibi-güşəni əlaya yaraşmaz qəfəs.*
کاربانی عشقه همراه اول سبیل اللـه ده، *Karbanı eşqə həmrah ol səbilullahda,*
کم کلام اللـه ناطق در بو منزلده جرس. *Kim, kəalmullahi-natiqdır bu mənzildə cərəs.*
چیخ طبیعت خانقاهندن که ظاهر کوره سن، *Çıx təbiət xaniqahından ki, zahir görəsən,*
سندن اوکدین یر یوزینی نیجه دوتمشدی فرس. *Səndən öndən yer üzüni necə tutmuşdı fərəs.*
عالم اللعنینک صفاتی در بو جمله کاینات، *Aləmul-eynin sifatıdır bu cümlə kainat,*
ظاهر و باطن ده یوخدر حقدن اوزکه هیچکس. *Zahiru batində yoxdur həqdən özgə hiçkəs.*
حقه ایررسن رخی انسان کاملدن اکر، *Həqqə irirsən ruxi insani-kamildən əgər,*
سن جمال اللـه باقی ایله اولسک ملتمس. *Sən camalullahi baqi ilə olasın mültəməs.*
دلربالر زلفنک سرّینه ایریشمز فقیه، *Dilrubalar xülfünün sirrinə irişməz fəqih,*
اول سببدن کم ایته حبل المتین اولمز مرس. *Ol səbəbdən kim, itə həblulmətin olmaz mərəs.*
کرچه مشکین طرّه لردن آچلور جنت ولی، *Gərçi müşkin türrələrdən açılır cənnət, vəli,*
اینجه سودادر بو سودا اکلمز هر بوالهوس. *İncə sevdadır, bu sevda anlamaz hət bulhəvəs.*
نفخۀ روح القدسدن زنده قلدی عالمی، *Nəfxəyi Ruhulqudusdan zində qıldı alımi,*
مهدی آدم دمی عیسی یدی موسی نفس. *Mehdiyi adəm dəmi, İsa yədi, Musa nəfəs,*
ای **سروری** رب العالمینوک نوری در، *Ey Sururi rəb- ələləminin nuridir,*
صورتی مهدیدن و عیسی دن اولن مقتبس. *Surəti Mehdidən u İsadan olan müqtəbəs.*

## **قافیۀ الشین**- (عدد ۱۰) ۱۱

ولـه

کوزک دورنده آهمدن دوتر هر بر مکان آتش[۲]، *Gözün dövründə ahımdan tutar hər bir məkan atəş,*
کاولر احراق مریخک[۳] کسلمز هر زمان آتش. *kolar ihraq Merixin kəsilməz hər zaman atəş.*
دله عکس خدک دوشسه بلورر ناله لر جانا، *Dilə əksi-xidəgin düşsə bilürür nalələr cana,*

---

[۱]. بو غزل باشقا منبع لرده یوخدور// واتیکان نوسخه سیندن آلینیبدیر- ص. ٦٧-٦٩// س. نوسخه سی ص.۲٥
[۲]. پروانه مجموعه سی : ۳٥۸۷
[۳]. پروانه مجموعه سی: مژنجک (سهو اوخونشدور)

که زیرا اب ایرشدکجه ایدر هردم فغان آتش. *Ki, zira ab irişdikcə edər hər dəm fəğan atəş.*
رقیبک سوزن ایشتسم قوپر آه اتمکه شوقم، *Rəqibin sözün eşitsəm, qopar ah etməgə şövqum,*
هوا سرد اولسه اولور لاجرم مطلوب جان(آتش). *Hava sərd olsa olur lacirəm mətlubi-can atəş.*
عذارنده خطن کورب صو دیاین دیمه ای دل، *Üzarında xəttin görüb, su diyəyin demə, ey dil,*
که بو مشهوردر اولمز جهانده بی دخان آتش. *Ki, bu məşhurdur olmaz cahansa bi duxn atəş.*
نکارا سوز عشقکدر **سرورینک** دوکن یاشن، *Nigara suzi-eşqindir Sururinin tökən yaşın,*
که اشک شمعه در باعث ایچنده کی ینان آتش. *Ki, əşki-şəmədir bais içindəki yanan atəş.*

ولــه

بر دلمی وار زلفک کبی ای دل پریشان اولممش[1]، *Bir dilmi var xülfün kibi,ey dil pərişan olmamış,*
بر جانمی واردر تکیهٔ عشقکده قربان اولممش. *Bir canmı vardır, təkyəyi-eşqində qurban olmamış..*
دردیله هرکم ایکیلر اولدکده فریادی دیکر، *Dərdiləhər kim, inilər öldükdə fəryadi digər,*
کیمدر دین غم زهرنه هر درده درمان اولممش. *Kimdirdeyən ğəmi-zəhrinə hər dərdə dərman olmamış.*
عشاقه اولورکن قریب دوینر[2] نفاق ایلر رقیب، *Uşşaqa olukən qərib, dönər nifaq eylər rəqib,*
بو دکلو اسلام اهلنی کورپ مسلمان اولممش. *Bu dənlü İslam əhlini görüb müsəlman olmamış.*
جسمک حیاتی جانله جانک دخی جاناله، *Çismin həyatı canilə canın daxi cananilə,*
بی جاندر اول تن کم انک جانینه جانان اولممش. *Bi candır ol tən kim, anın canına canan olmaməş.*
باغه **سروری** وارجق اول کلرخم کوله کوله، *Bağa Sururi varacaq, ol gül ruxum gülə-gülə,*
دلتنک اولن کل غنچه سی قلمادی خندان اولممش. *Diltəng olan gül ğönçəsi qalmadı xəndan olmamış.*

ولــه

دآمن غیره یتر ای دل بیچاره پیش، *Dəməni-qeyrə yetər, ey dili-biçarə piş,*
چاره اولسون دیرایسک دردکه وار یاره پیش. *Çarə oldun dir isən, dərdinə var yara piş.*
نقش دیوارندن اویکنور ای دوست دیدم، *Nəqşi-divarından öykünür, ey dost dedim,*
دیدی باللــه بنی قویوری دیوآره پیش. *Dedi nillah bəni qoyuri divara piş.*
یره چالمق دلر ایسک الوپ اغیارا یغن، *Yerə çalmaq dilər isən alıb ağyara yaxın,*
قارشوسنده وار انک ساعد دلداره پیش. *Qarşısında var anın said dildara piş.*
نچه آواره یوررسن به کوکل شویله لوند، *Necə avara yürürsən be könül şöylə ləvənd,*
دوت بر ایش باشنی کل زلف سیه کاره پیش. *Tut bir iş başını , gəl xülfi siyəh kara piş.*
راحته کمسه ایرشمز چو **سروری** بی رنج، *Rahətə kimsə irişməz çü Sururi bi rənc,*

---

[1]. نظمی مجموعه سی: ۲۱۳۷
[2]. نظمی مجموعه سی: تورمز

دست‌رس استرایسک کرکله کل خاره پیش. *Dəstrəs istər isən kurkilə gül xarə piş.*

ولـه

شو مجلسده که ساقینک لب لعلی مدام اولمش، *Şu məclisdə ki, saqinin ləbi-ləli mudam olmuş,*
کتاب عشق ایچنده ایچممک انده حرام اولمش. *Kitabi-eşq içində içməmək anda həram olmuş.*
یوزینک صانکه هر یانی اولپدر صفۀ جامع، *Üzün sanki hər yanı olubdur səfəyi-came,*
که هر محراب ابرو ایچره هر بر کوز امام اولمش. *Ki, hər mehrabi-əbru içrə hər bir göz imam olmuş.*
یوزینه قرشو کلدوکن کورپ بدرک او کون یوزلو، *Üzünə qarşı gəldigin görüb bədrin o günüzlü,*
مقابل اولمیوب دیدی بونک ایشی تمام اولمش. *Muqabil olmayıb, dedi bunun işi tamam olmuş.*
دعاء خیر الوردی دایما زلفک بنم عمرم، *Duayi xeyr alırdı daima xülfün bənim ömrüm,*
انوکچون اوزیوپ عمری جانده مستدام (اولمش). *Anunçün uzuyub ömri, canda müstədam olmuş.*
ایرشمز عالم اطلاقه شولکم قیدی ترک اتمز، *İrişməz alımi-itlaqa şol kim, qeydi tərk etməz.*
**سروری** زاهدی کور کم اسیر ننک و نام اولمش. *Sururi zahidi gör kim, əsiri-nəngu nam olmuş.*

ولـه

شوکم جام لبندن ایلدی نوش، *Şu kim, vami-ləbindən eylədi nuş,*
نه غم قلدی دل و جانن فراموش. *Nə ğəm aıldı dil u cann fəramuş.*
کوریجک لعلی جامن اهل مجلس، *Göricək ləli camın əhli-məclis,*
اولور بی می قموسی مست و مدهوش. *Olur bi-mey qamusi məstu mədhuş.*
خمار و دردسرله بنده کورسم، *Xumaru dərisər ilə bən də görsəm,*
لبینی اولورم غایتده سرخوش. *Ləbini oluram ğayətdə sərxoş.*
دیدم اغیاره کوسترمه فقیری، *Dedin əğyara göstərmə fəqiri,*
دیدی ایتلره ویراین سنی اوش. *Dedi: itlərə verəyin səni, uş.*
کل ایامنده منع اتمک شرابی، *Gül əyamında mən etmək şərabı,*
دیمکدر بلبله اول شمدی خاموش. *Dedməkdir bülbülə, ol şimdi xanuş.*
زن غم نوله بوش اولرسه بر ذن، *Zəni-ğəm nola boş olarsa bizdən,*
همیشه ساغری ساقی قومز بوش. *Həmişə sağəri saqi qomaz boş.*
**سروری** سینه ده تیرک طوتپدر، *Sururi sinədə tirin tutubdur,*
ایدر قدک اکوپ انی در اغوش. *Edər qədin əküb anı dər ağuş.*

ولـه نظیرۀ محرمی

چوق یازدی کرچه بر نچه صوره نکار نقش، *Çox yazdı gərçi bir neçə surət nigar nəqş,*

شکلک کبی یازلمذمی هیچ ای نکار نقش.
*Şəklin kibi yazılmazmı hiç ey niga nəqş.*
خطک ایرشدی لوح دله بوزدی صورتم،
*Xəttin irişdi lönhi-dilə bozdı surətim,*
یازدی اکرچه وصل ایچون انده هزار نقش.
*Yazdı əgərçi vəsl üçün anda hizar nəqş.*
اول وصف عارض ایله اولور صو کبی روان،
*Ol vəsfi-ariz ilə olur su kibi rəvan,*
کر بغلنورسه شعرمه بر آبدار نقش.
*Gər bağlanırsa şeirimə bir abdar nəqş.*
رنکین زمین اوزره بولت کیبی زلفکی،
*Rəngin zəmin üzrə , bulut kibi xülfüni,*
یازمادی مانی کیبی یزن بی شمار نقش.
*Yazmadı Mani kibi yazan bi-şumar nəqş.*
صافی دلمده ایلدی تصویر عشقنی،
*Safi dilimdə eylədi təsvir eşqini,*
چوق کچدی باکه نیلیم اول شیوه کار نقش.
*Çox keçdi bana, neyləyin ol şivəkar nəqş.*
قلمش قرار قاره خطی اول عذارده،
*Qılmış qərar qara xətti ol üzarədə,*
صو اوزره کرچه ایلمز ایدی قرار نقش.
*Su üzrə gərçi eyləməz idi qərar nəqş.*
قو نقشی کل صفایله نقاشه قل نظر،
*Qo nəqşi, gəl səfa ilə nəqaşa qıl nəzər,*
بو خانه ده **سروری** یزه چون نکار نقش.
*Bu xanədə Sururi yaza çün nigar nəqş.*

ولـه نظیرهٔ نشانی

اولوپ کرم اهه اویوپ اشکه دل رخساره یصدنمش [1]،
*Olub gərm ahə, uyub əşkə, dil ruxsara yasdanmış,*
انینمش بلد و آبه طینمش ناره یصدنمش.
*İnanmış badə vu aba dayanmış, nararə yasdanmış.*
چون اوزم حسرتندن یصدنور دیوار باغی خلق،
*Çün üzüm həsrətindən yasdanır divar bağı xəlq,*
فراقندن کلک بلبل یوز اورمش خاره یصدنمش.
*Fəraqından gülün bülbül üz vurmuş, xarə yasdanmış.*
طبیبم صاغ اولان باش استمز یصدق محلکده،
*Təbibim sağ olan baş istəməz yasdəq , məhəllində,*
یتور عشاق پر دردک در و دیواره یصدنمش.
*Yatur uşşaqi pur dəedin dəru divara yasdanmış.*
یوز اورپ خاک پایوکه سنک هر کون کون ای ماهم،
*Üz vurub xaki-payına sənin hər gün gün,ey mahım,*
باشنده شمسی دلبندینی اول آواره یصدنمش.
*Başında şəmsi-dilbəndini ol avara yasdanmış.*
دوشبدر چشم پرخونه خیال چشم مخمورک،
*Düşübdür çeşmi-puxuna xyali-çeşmi məxmurun,*
صناسن می قباغن رند اولان میخواره یصدنمش [2].
*Sanasan mey qabağın rind olan meyxarə yasdanmış.*
دکلدر انجم آلتنده کورینن ای کنش بدر آی،
*Dəgildir əncum altında görünən ey günəş, bədr ay,*
که بو بر کرده بالشدر انی سیاره یصدنمش.
*Ki, bu bir girdə balışdır, anı səyyarə yasdanmış.*
**سرورینک** یریدر کر یری اوچمق اوله یارن،
*Sururinin yeridir, gər yeri uçmaq ola yaran,*
ویررکن جان بکون طاش ایشکک بیچاره یصدنمش.
*Verirkən can bugün taş eşigin biçarə yasdanmış.*

---

۱. پروانه مجموعه سی : ۳٤۰۷.
۲. پروانه مجموعه سی: بو بیت یوخدور

Qeyd etdiyimiz kimi, XV-XVI əsrlər, eləcə də sonrakı dövrlər Azərbaycan ədəbiyyatına təsir etmiş sənətkarlardan biri də böyük özbək şairi Əlişir Nəvai olmuşdur. Ədəbiyyatşünaslar Füzulinin, ondan əvvəl Kişvəri, Həbibi, Xətainin Nəvai sənətindən təsirləndiyi barədə fikir söyləmişlər. Fikrimizcə, ədəbiyyatımızda Füzulidən öncə Nəvai yaradıcılığından bəhrələnən şairlər içində Sürurinin də adını çəkmək lazımdır. Məlum olduğu kimi, Füzuli Nəvai şeirlərinə (o cümlədən, "Görgəc" rədifli qəzəlinə) nəzirə olaraq qəzəl yazmışdır. Divan nüsxələrini nəzərdən keçirəndə görürük ki, Sürüri də Nəvai yaradıcılığından bəhrələnmiş, onun "Görgəc" rədifli qəzəlinə

Qərar etməz könül qaşunla qəmzəndən nişan görgəc,
Həvayi-mürğə nisbət kim, qaçar tirü kəman görgəc (18, v.5a).

-mətləli nəzirə yazmışdır.

Sürüri əsərləri ilə Şah İsmayıl Xətai əsərləri arasında səsləşmələr mövcuddur. Təxminən eyni vaxtda yaşamış bu sənətkarların hansının əsərinin örnək olduğu məsələsi sual doğura bilər. Fikrimizcə, Şah İsmayılın gənc hökmdar ikən sarayına dəvət etdiyi Sürüri ondan daha yaşlı olmalı idi və Xətainin onun şeirlərini örnək seçmək ehtimalı daha çoxdur. Şah İsmayıl Xətainin

Biz əzəldən ta əbəd meydanə-gəlmişlərdənüz,
Şahi-Mərdan eşqinə mərdanə gəlmişlərdəniz (34, s.190)

-mətləli qəzəlinin Sürurinin eyni mətləli qəzəli ilə müqayisəsi maraq doğurur. Müqayisə göstərir ki, misraların çoxu üst-üstə düşən, bəzi sözləri fərqlənən bu iki şeir əslində bir müəllifin qəzəlidir. Bu fikirdəyik ki, şeirlərinin Süruri yaradıcılığı ilə yaxınlığı katibləri çaşdırmış, onlar Sürurinin bu şeirini Xətai divanına daxil etmişlər. XVII əsrdə yaşamış Azərbaycan şairi Qövsi Təbrizinin də Süruri yaradıcılığından bəhrələndiyini görürük. Sürurinin "Cana, həlak edərdi məni qəm dedikləri" misrasıyla başlanan, 7 beytdən ibarət

Füzuli isə eyni qafiyəli beytində tikana da su tökməyin faydalı ola biləcəyindən danışır. O deyir: Əgər sevgilimin üzünü yad edərkən göz yaşlarımdan kipriklərim sulansa, eybi yoxdur. Gülə su verilərkən tikan da sulanır:

Arizin yadilə nəmnak olsa müjganım nola,
Zaye' olmaz gül təmənnasilə yermək xarə su (33, s.31).

Burada lətfü nəşr poetik fiqurundan məharətlə istifadə edilmişdir. Birinci misradakı ariz (üz) və müjgan (kiprik) sözləri ikinci misradakı gül və xar (tikan) sözləri ilə əlaqələndirilmişdir.
Süruri coşqun axan suyu zəncirini sürüyüb gedən divanəyə bənzədir, onu özü kimi aşiq və avara adlandırır:

Sanki bir divanədir, zəncirini sürüb gedər,
Ya Süruri kibi olmuş aşiqü avara su (18, 4a).

Füzuli də eyni qafiyəli beytində aşiq, divanə olan sudan danışır. O, neçə vaxtdır ki, məşuqənin ayaqlarının altına çatmaq üçün avaralar kimi başını daşdan-daşa vurub gəzməkdədir:

Xaki-payinə yetəm der ömrlərdir müttəsil,
Başını daşdan daşa vurub gəzər avara su (33, s.32).

Müqayisələr Füzulinin qüdrətli söz sənətkarı Sürurinin yüksək poetik xüsusiyyətlərə malik əsərlərindən təsirləndiyini, onun şeirlərinə nəzirələr yazdığını sübut edir. Lakin bununla bərabər Füzulinin özünəməxsus fərdi bədii üslubunun gənclik illərindən formalaşdığı da şübhə doğurmur. Ömrünün mühüm hissəsini Osmanlı dövlətinin təəbəsi kimi yaşamış Füzuli "Leyli və Məcnun" məsnəvisini, qəsidəsini, Osmanlı hökmdarı Sultan Süleymana ithaf etdiyi kimi, onun yaşlı müasiri, ömrünün son dövrlərini bu ölkədə yaşamış Süruri də həmin şaha qəsidə ithaf etmişdir.

Füzuli Sürurinin bir sıra qafiyələrini təkrar etmişdir. Süruri qəsidəsinin beytlərində yara sözünü həm yar, sevgili, həm də yara mənasında işlətmiş, cinas yaratmışdır. Şeirin mətlə beyti belədir:

Sun ləbindən yarəli bağrıma –dedim yarə su,
Ol təbibi-canü dil dedi ki, sevməz yarə su ...

Gərçi bipadır, vəli müştaqdır pabusinə,
Üzi üzrə sürünüb, varır anınçün yarə su (18, 2b-3a).

Lirik qəhrəman-aşiq sevgilisindən xahiş edir ki, deyir yaralı bağrına dodaqlarından su töksün. O isə cavab verir ki, yaraya su vurmaq olmaz. İkinci beytdə şair deyir ki, suyun ayağı olmasa da, o, məşuqənin ayaqlarını öpməyə can atır. O, həmişə üzü üstə sürünərək yara doğru gedir. Burada suyun aşiq kimi nəzərdən keçirilməsi təbiətdə, ətraf mühitdə aşiqin əlamətlərini görən Füzulinin, bədii məntiqini xatırladır. Görünür, bu məsələdə də şair özündən əvvəl gələn Süruri kimi sənətkarlardan örnək götürmüşdür. Füzuli həmin qafiyədən qəsidəsində belə istifadə etmişdir:

Vəhmdən söylər dili-məcruh peykanın sözün,
Ehtiyat ilə içər hər kimdə olsa yarə, su...

Dəstbusi-arizusundan gər ölsəm, dustlar,
Kuzə eylin toprağım, sunun onunla yarə su (33, s.31).

Aşiqin yaralı könlü məşuqənin oxabənzər kipriklərindən vəhmlə, qorxa-qorxa danışır. Necə ki, yaralı olan şəxs suyu ehtiyatla içir. Növbəti beytdə şair deyir ki, əgər sevgilimin əlini öpmək arzusunun şiddətindən ölsəm, torpağımdan kuzə düzəldib, onun içinə su töküb yarıma verin.

Beytlərindən birində Süruri deyir ki, tikana su tökməklə meyvə vermədiyi kimi, göz yaşı tökməklə düşmənin ürəyinə rəhm gəlməz:

Bunca tökdüm göz yaşın, düşmən tərəhhüm qılmadı,
Meyvə verməz hər nədənli verilirsə xarə su (18, s. 3b).

Sürurі divanının Kaliforniya nüsxəsində üç qəsidə vardır. Bunlardan birincisi “Asiman”, ikincisi “Su” rədifli şeirdir. Üçüncü qəsidə “Zülfün səhabı içrə olub gün yüzün nihan” misrasıyla başlanır. Füzulinin 32 beytlik “Su” rədifli qəsidəsinin Sürurinin 31 beytlik eyni rədifli, eyni vəznli qəsidəsinə nəzirə olaraq yazıldığını görürük. Məlum olduğu kimi, Füzulinin dini mövzuda yazdığı, tarixi şəxsiyyətlərə, Osmanlı sultanına, Bağdad hakimlərinə həsr etdiyi qəsidələri vardır. Onun elə qəsidələri vardır ki, baharın, səbanın, suyun, xəncərin təsviri ilə başlasa da əsərin gedişində şair ictimai, fəlsəfi, dini fikirlərini ifadə edir. Füzuli yüksək estetik zövqünü nümayiş etdirdiyi “Su” rədifli qəsidəsində suyun həyatdakı rolundan danışır, ona bir aşiq, şair gözü ilə baxır, sonda isə məlum olur ki, bu deyilənlər Məhəmməd peyğəmbərə (s.) həsr edilmiş nətin əvvəli imiş. Tədqiqatçı Vəcihə,Feyzullayeva “Füzulinin qəsidələri” adlı monoqrafiyasında onun bu əsəri barədə yazır: “Şairin hər bir kəlməsində, onun xəyal zənginliyindən axıb gələn səmimi və inandırıcı ifadələr vardır. Təkcə şairin “Su” rədifli qəsidəsini götürsək, burada Füzuli qələminin qüdrəti özü-özlüyündə aydınlaşır... Yüksək sənətkarlıqla yazılmış bu qəsidədə Füzulinin estetik zövqü, dərin mühakimə bacarığı öz ifadəsini tapmışdır” (31, s.160-161). Füzuli şeiri üçün örnək rolunu oynamış Sürurі qəsidəsində də həyatda, təbiətdə sudan bəhs olunur, suyun bəzi fiziki xüsusiyyətləri mənalandırılır, sonda məlum olur ki, bu əsər Osmanlı imperatoru Sultan Süleymana mədhiyyədir:

Şah Süleyman həzrəti kim, şəhlər Asəfdir ana,
Cuş edib sərdəftər oqı anı hər sərdara, su ( 18, v.3b)

Burada müəllif təlmihdən istifadə etmişdir. Süleyman peyğəmbər haqqında əfsanədən məlumdur ki, onun Asəf adlı vəziri olmuşdur (32, s.24). Şair suya müraciətən deyir ki, bütün şahların Sultan Süleymana vəzir olduğunu hər yerə səs salıb sərdarlara, hökmdarlara xəbər ver.

Qansı bəzm olmuş münəvvər bir qədin tək şəm'dən,
Qansı şəm'in şö'ləsi rüxsari-tabanınca var? (21, s.115)

Süruri qəzəlinin məqtəsində şeirinə bədii yekun vuraraq bu təsvir olunan gözəlliklərin sahibi məşuqəsinə eşqindən çəkdiyi əfğanın bülbülün güldən ötrü fəryadlarından xeyli artıq olduğunu bildirir:

Ey Süruri, ol güli-rəna qəmindən bülbülün,
Qanğı fəryadı sənün fəryadü əfğanınca var? (29, v.18a).

Füzuli də örnək qəzəlin bədii məntiqindən çıxış edərək sonda özünün eşqində çəkdiyi ahü əfğanın bülbülün ürəkləri dağlayan nəğməsindən daha üstün, daha təsirli olduğunu deyir:

Qansı gülşən bülbülün derlər, Füzuli, sən kimi,
Qansı bülbülün sürudi ahü əfğanınca var? (21, s.115).

Professor Mir Cəlal Paşayev Füzulinin bu qəzəlindəki bədii sualların ritorik mahiyyətdə olması, yəni cavab alınmaq üçün verilməməsi və təşbihlərin özünəməxsusluğu barədə yazır: "Söz ustalığının, şeir incəliyinin, nadir bədii lövhələrin bir sıra nümunə xüsusiyyətlərini verən və əsl lirik əsərlərdən sayılan bu qəzəlin çox cəhətdən ritorik sual ilə başlandığını görürük. Hiss və həyəcandan doğan bu suallar adi, məntiqi sual deyil, bədii suallardır. Bu suallar cavab almaq üçün yox, faktı, hadisəni təsdiq üçün, şairin rəyini bildirmək, gözə çarpdırmaq üçün verilir; "Qansı şəm'in şöləsi rüxsari-tabanınca var"- deyə yazdıqda şair "heç bir şamın, heç bir çırağın işığı sənin rüxsarın qədər işıqlı deyildir",- demək istəyir. Təsdiqini sual şəklində deyir.
Təşbehlər isə çox qəribə və indiyə qədər az rast gəldiyimiz maraqlı bir sistem ilə qurulmuşdur. Hər bir misrada qüvvətli bir təşbeh vardır" (30, s.81). Gördüyümüz kimi, Füzulinin yaradıcılığının ilkin mərhələlərində özünəməxsus şeir texnikasına sənətkarlığa sahib olmasında şeirlərinə nəzirə yazdığı Sürurinin ədəbi irsinin də rolu olmuşdur.

çıxan yeni-yeni mənbələrini araşdırdıqca bir daha görürük ki, onun fərdi üslubunun formalaşmasında sələflərinin irsinin təsiri olmuşdur. Bu baxımdan Sürurinin “Qanğı ay ayineyi-rüxsari-tabanıncadur?” misrasıyla başlanan 8 beytlik qəzəli ilə Füzulinin ona nəzirə olaraq eyni vəzndə yazdığı “Qansı gülşən gülbüni sərvi-xuramanınca var” misrasıyla başlanan 7 beytlik qəzəlinin müqayisəsi maraqlı nəticələrə gəlməyə imkan verir. Əvvəla, orasını qeyd edək ki, Füzuli şeirində fərqli olaraq “var” rədifindən istifadə etsə də, rədifdən kənarda bu iki şeirin beytlərinin həmqafiyə kimi səslənməsi göz qabağındadır. Məsələn, xəndanıncadır-xəndanınca var. Deməli, Füzulinin fərqli olaraq rədif işlətməsi onun şeirinin Sürurі qəzəlinə cavab olduğunu inkar edə bilməz. Hər iki şeir bənzətmələr, təşbihlər eyni zamanda bədii sual üzərində qurulmuşdur. Sürurі qəzəlində 7 dəfə “qanğı” (1 dəfə handa) Füzuli 14 dəfə (7 beytlik qəzəlinin bütün misralarında) “qansı” sual ədatından istifadə etmişdir. İlk baxışdan görünür ki, bədii suallar vasitəsi ilə və hər misrada yeni-yeni təşbihlər işlətməklə şeir texnikasına yiyələnərkən Füzuli Sürurі qəzəlindən nümunə kimi yararlanmışdır. Sürurі qəzəlinin birinci beytində gözəlin işıqlı üzünün aydan, dodaqlarının əksinin günəşdən, altıncı beytində onun qəddinin cənnətdəki Tuba ağacından üstün olduğunu deyir:

Qanğı ay ayineyi-rüxsari-tabanıncadur?
Qanğı xurşid andə əksi-ləli-xəndanıncadur...

Qanğı Tubanın İrəm bağında rənalanması,
Etidal içrə sənün qəddi-xuramanıncadur (29, v.17b-18a).

Füzulinin cavab qəzəlindəki təşbihlər mübaliğədən daha uzaq, reallığa daha yaxındır. O, gözəlin boynunu sərvi-xuramanını qızıl gül ağacından, dodağını qönçədən, parlaq simasını şamın şöləsindən üstün hesab edir:

Qansı gülşən gülbüni sərvi-xuramanınca var?
Qansı gülbin üzrə qöncə ləli-xəndanınca var?...

Arizinlə zülfü qaşın ortasında ruhların,
Ərşdür, üzündə Rəhman surəsi, altında ab  (29, v.9b)

Füzuli həmin qafiyə ilə yazdığı beytində tamam başqa mövzuya toxunur. Bədii sual poetik fiqurundan istifadə edərək saqidən, gözəldən soruşur ki, əlində tutduğun gümüş badədəki ləl rəngli qırmızı şərabdır, yoxsa ləldən olan üzük qaşı sənin dodaqlarının gözəlliyini görüb paxıllıqdan suya dönmüşdür:

Lə'lgun meydir əlində sağəri-simin ilə,
Ya nigini-lə'ldir, rəşki-ləbindən oldu ab?  (21, s.66).

Beytlərindən birində Sürури məşuqəyə müraciətən deyir ki, gözəlliyin nə möcüzədir ki, əsmai-hüsna dəftərindən onu seçmiş, intixab etmişlər? [Quranda əsmai-hüsna" ən gözəl isimlər, Tanrının adları mənasında işlədilir. (7/180, 17/110, 59/24)]. Burada da Tanrının yaratdıqlarının əşrəfi olan insanda Yaradanın təcəlli etməsindən söhbət gedir:

Vəh nə möcüzənamədür hüsnün kim, anı əqli-küll,
Eyləmiş əsmai-hüsna dəftərindən intixab (29, v.9b).

Füzuli isə eyni qafiyəli beytində məşuqəsinə üz tutaraq deyir ki, Yaradanın qələmi sinəmin lövhəsində səni mənə yazmışdır, bununla da gözəllərin içindən səni seçmişdir:

Kilki-qüdrət lövhi-sinəmdə səni qılmış rəqəm,
Eyləyib məhbublər məcmuəsindən intixab  (21, s.66).

Üç qüdrətli sənətkarın-Nəsimi, Sürури və Füzulinin eyni qafiyəli qəzəllərini nəzərdən keçirdikdə bir daha görürük ki, Nəsimi də onun şeirinə nəzirə yazmış Sürури də, Füzuli də öz yaradıcılıq dəst-xəttinə, fərdi üsluba malik şair olmuşlar.

Dahi Füzulinin özünəməxsus yaradıcılıq üslubunun ondan sonra gələn şairlərə təsir etməsi şübhə doğurmur. Lakin ədəbiyyat tariximizin üzə

qəzəllərindən birində və Füzulinin qəzəlində birinci beyt eyni cür-niqab-aftab kimi qafiyələnmişdir. Nəsimi şeirlərinin qafiyələri belədir: Birinci şeir: niqab, aftab, şərab, ab, xab, bab, ümmül-kitab, yövmül-hesab, bis-səvab, cavab, hicab, xitab. İkinci şeir: niqab, nəcab, hicab, kitab, bab, niqab, ictinab, bis-səvab. Sürури qəzəllərinin qafiyələri belədir: Birinci şeir: niqab, aftab, turab, şərab, hübab, ümmül-kitab. İkinci şeir: niqab, hübab, xoşab, aftab, ruyi-ab, tab, şərab bab-bab. Füzuli qəzəlinin qafiyələri belədir: niqab, aftab, mahtab, gülab, hübab, ab, intixab, bis-səvab. Sürurinin Nəsimi qəzəllərindəki niqab, aftab, ab, şərab, ümmül-kitab kimi qafiyələri, «Mən indəhu ümmül-kitab" ("Yanında (İlahi) kitabın bilgisi olanlar") Quran kəlamını (Surə 13, ayə 43) təkrar etməsi onun Nəsimidən bəhrələndiyini göstərir.
Süruri qəzəlində bahar fəslini, ilahi lütfün təzahür etdiyi bağ və gül fəslini təsvir edir, təbiətin gözəlləşməsini ilahi qüdrətlə izah edir. Şair göstərir ki, ilin bu gözəl vaxtında hər çəmən bir asimana, hər çiçək bir günəşə çevrilmiş, göylər yer üzünə qibtə etməyə başlamışdır:

Feyzi-hikmətdən nə qüdrətdür kim, olur günbəgün,
Hər çəmən bir asimanü hər çiçək bir aftab.

Yer yüzün rəşki-səmavat eylədi gül fəsli kim,
Səbzeyi-çərx atlas oldı, kəhkəşan həm ruyi-ab...

Ey Süruri, bağü gül fəslində bir məcmudur
Kim, açılmışdır lətafət dəftəründən bab-bab  (29, v.9b)

Füzulinin cavab qəzəlindəki qafiyələr  şeirin məzmunu onun hər iki sələfinin əsərləri ilə tanış olduğunu, bununla bərabər öz üslubunda orijinal əsər yarada bildiyini göstərir. Nəsimi kimi, Füzuli də qəzəlinin son beytində "Vəllahü ə'ləm bis-səvab" ("Doğrusunu Allah daha yaxşı bilər")  kəlamını işlətmişdir. Füzulinin qəzəlində öncəki şeirlərdən fərqli olaraq "mahtab, gülab" qafiyələrini işlətmişdir. Süruri "ab" qafiyəli beytində insan üzündə ilahi əlamətlərin, Quran surələrinin təzahüründən danışır:

Sürurinin “Aftabi-təl’ətindən rəf olur çün kim niqab”, “Gül yüzündən çün səba məşşatəsi açdı niqab” misralarıyla başlanan qəzəlləri Nəsiminin “Şol tamam ayın üzündən çünki rəf oldu niqab” misrasıyla başlanan qəzəlinə nəzirədir (Nəsiminin eyni qafiyəli, “Vəchdən dilbər götürmüşdür niqab” misrasıyla başlanan qəzəli başqa vəzndə olsa da, məzmun eynidir və Sürurinin eyni zamanda bu şeiri də örnək götürməsi ehtimalı böyükdür). Nəsiminin şeirində dünyəvi gözəlliklərdə təzahür edən ilahi gözəlliklər, dünyəvi, məcazi eşqdən doğan həqiqi eşq, Yaradana olan eşq tərənnüm edilir. Dünyanın hər bir gözəlliyi insanın zövqünü oxşayır, eyni zamanda Tanrının hikmət və qüdrətindən xəbər verir:

Şol tamam ayın üzündən çünki rəf oldu niqab,
Zülmətin dövranı keçdi, zahir oldu aftab...

Ey yanağın həsrətindən cənnətin qəlbində nar,
Vey dodağın şərbətindən kövsərin eynində ab!

Ey üzün həmra gülündən lalənin camində mey,
Vey gözün sevdalarından nərgisin gözində xab! (25, s.22)

Bu şeirdə şairin insan üzündə İlahinin təcəlli etməsi barədə hürufi düşüncələri də əksini tapmışdır:

Surətin lövhində yazılmış hürufi bilməyən,
Bilmədi sövmü səlatı, sağişi-yövmül-hesab.

Ali-heyvandır dodağın, ruhi-qudsidir dəmin,
Surətin Həqdir, üzün vallahü ə’ləm bissəvab (26, s.22).

Sürurinin hər iki cavab qəzəlində Nəsimi şeirinin əsas məzmununun əksini görürük. O, nəzirələrindən birincisində Nəsimidən təsirlənərək Qurandan bir sıra iqtibasları ayrı-ayrı misralarına daxil etmişdir. Fikrimizcə, Füzuli Nəsiminin də, Sürurinin də adı keçən şeirlərindən xəbərdar olmuş, nəzirəsində yalnız özünə məxsus fərdi yaradıcılıq üslubunu nümayiş etdirə bilmişdir. Maraqlıdır ki, Nəsimi və Süruri

onu üstələyən əsər yazır, bununla da yaradıcılıq yolunda irəliləyir və kamilləşir. Tədqiqatçı Fazil Seyidov yazır: “Məlumdur ki, hər şairin şeirinə nəzirə yazılmır. Şeirinə nəzirə yazılan şair xalqın ən görkəmli və sevimli şairidir. Fars şairlərindən Sədi, Hafiz və Ürfi kimi adlı-sanlı şairlərin şeirlərinə nəzirə yazıldığı kimi, Azərbaycan şairlərindən də ən çox Füzulinin və Saibin qəzəllərinə nəzirələr yazılmış və təxmislər edilmişdir” (28, s.337). Anadilli poeziyamızda nəzirə və təxmisin ən gözəl nümunələrini yaradan sənətkarlardan biri də Füzulidir. Məlum olduğu kimi, böyük şair Həbibinin

Gər səninçün etməyəm çak, ey büti-nazikbədən,
Qəbrim olsun ol qəba, əynimdə pirahən kəfən

-mətləli qəzəlinə təxmis bağlamış,

Dün gördüm ol nigarı tərəbnakü ərcümənd,
Kafur əlilə dəstələmiş ənbərin kəmənd,
Baxdım şikənci-türrəsinə zarü müstəmənd,
Bir şəxsi-natəvan oturur gərdənində bənd,
Kimdir bu şəxs, ol nə rəsəndir-dedim, dedi:
Zülfüm kəməndi tutsağı canındurur sənin

bəndi ilə başlanan müsəddəsinə

Dün sayə saldı başimə bir sərvi-sərbülənd
Kim, qəddi dilruba idi, rəftarı dilpəsənd,
Göftarə gəldi ta ki, açıb ləli-nuşxənd,
Bir püstə gördüm onda, tökər rizə-rizə qənd,
Sordum: Məgər bu dürci-dəhəndir,-dedim, dedi:
-Yox, yox, dəvayi-dərdi-nihanındurur sənin

-bəndi ilə başlanan müsəddəs-nəzirə yazmışdır.

Füzulinin Süruri şeirlərinə yazdığı nəzirələrdə şairin bir tərəfdən sələfindən öyrəndiyini, onun əsərlərindən sənətkarlıq məktəbi, örnək kimi istifadə etdiyini, digər tərəfdən bu şeirlərə yeni bir ahəngdarlıq, məna dərinliyi, yüksək bədii zövq gətirdiyini görmək mümkündür.

qəzəlinə örnək olmuşlar. Fikrimizcə, Füzulinin aşağıdakı misralarla başlanan qəzəlləri Süruri şeirlərinə nəzirə olaraq yazılmışdır: Füzuli “Şəm üzündən aləmi rövşən qılıb saldın niqab”, “Münhərifdir, saqiya, ənduhi-dünyadən mizac”, “Olur qəddim düta eşqin yolunda hər bəla görgəc”, “Seyr qıl, gör kim, gülüstanın nə abü tabı var”, “Qansı gülşən gülbüni sərvi-xuramanınca var”, “Xəm gədilə ağlaram ol türreyi-tərrarsız”, “Eyş üçün bir türfə mənzildir bahar əyyamı bağ” misraları ilə başlanan qəzəllərini yazarkən Sürurinin “Gül yüzündən çün səba məşşatəsi açdı niqab”, “Zahida, qılmış quru sevda səni yə’si-fərac”, “Qərar etməz könül qaşınla qəmzəndən nişan görgəc”, “Qanğı sünbüldür ki, miskin kakilin tək tabı var”, “Qanğı ay ayineyi-rüxsari-tabanınca var”, “Kakilin fikrində gözüm yaşı getməz ahsız”, “Yandırır xalun xəyali xəttin içün dildə dağ” misrasıyla başlanan qəzəllərini örnək götürmüşdür. Süruri divanının Kaliforniya nüsxəsi nəzərdən keçilərkən məlum oldu ki, Füzulinin 32 beytdən ibarət,

Saçma, ey göz əşkdən könlümdəki odlarə su
Kim, bu dənklü tutuşan odlara qılmaz çarə su

-beyti ilə başlanan “Su” rədifli qəsidəsi

Sürurinin 31 beytlik

Sun ləbindən yarəli bağrıma dedim yarə su,
Ol təbibi-canü dil dedi ki, sevməz yarə su

-beytilə başlanan eyni rədifli qəsidəsinə nəzirədir. Siyahını uzatmaq mümkündür. Buradakı bəzi örnək qəzəllərlə nəzirələr arasında qafiyə fərqlərinin olduğunu görürük. Lakin bu şeirlərin məzmunu nəzərdən keçirildikdə onların arasındakı örnək-nəzirə münasibətləri aşkara çıxır. Şairlər arasındakı sələf-xələflik münasibətlərini genişləndirən, onların ustadların sənətkarlığını öyrənib kamilləşməsinə kömək edən nəzirə, eləcə də təxmislər əslində bir ədəbi yarışdır. Şair nəzirəsində yüksək bədii üslubda dərin hiss, həyəcan və fikirlərin ifadə edildiyi əsəri örnək seçib forma və mənaca onun səviyyəsinə uyğun gələn, bəlkə də

Xuni-dil birlə yazar vəsfi-camalın Kişvəri,
Ey güli-xəndan, bu rəngin dəftərü divana-bax (27, s.68a).

Ədəbiyyat tariximizdə “Bax” rədifli şeirlərin sonrakı taleyi də çox maraqlıdır. Molla Vəli Vidadi, Molla Pənah Vaqif, Mir Möhsün Nəvvab və bir sıra digər şairlərimizin həmin rədiflə yazdıqları çox dəyərli şeirləri vardır. Fikrimizcə, anadilli poeziyamızda “Bax” rədifli ilk qəzəl İmadəddin Nəsimiyə məxsus olmuş,sonrakı dövrlərin sənətkarları həmin rədiflə şeir yazarkən onun əsərindən örnək kimi istifadə etmişlər. Füzulinin Nəsimi əsərlərini oxuması tədqiqatçılarımız tərəfindən sübut edilsə də qeyd etməliyik ki, Füzulinin “Bax” rədifli qəzəli məhz Sürurinin eyni rədifli şeirinə nəzirədir. Hər iki şeirin Nəsimi, Qazi Bürhanəddin və Kişvəri qəzəllərindən fərqli olaraq eyni vəzn və qafiyə ilə yazılması bunu iddia etməyə imkan verir.

Süruri divanının yeni əldə edilmiş nüsxələri göstərir ki, Füzulinin onun qəzəllərinə yazdığı nəzirələrin sayı tədqiqatçılarımızın göstərdiklərindən daha çoxdur. Əvvəla, onu qeyd edək ki, Füzulinin “Bax” rədifli qəzəlinə örnək olmuş Süruri qəzəllərinin sayı dörddür. Sürurinin eyni rədifli və vəzndə digər qəzəllərin mətlələrini aşağıda veririk:

Ey könül, gəl dideyi-təhqiq ilə əşyayə bax
Kəsrəti-surətdə vəhdət göstərən mənaya bax...

Arizi-Leylidə hali-xali-gəndümgunə bax,
Hüsni miratında əksi-dideyi-Məcnunə bax

Ey könül, ol qəmzeyi-gəmmaz ol əbruyə bax,
Baş çatub nə sehr edərlər, ol iki caduyə bax.

Bu üç şeirdən yalnız ikicisinin qafiyəsi fərqlidir. Öncə haqqında danışdığımız qəzəllə bərabər Sururinin digər iki qəzəli də (cəmi üç şeir) rədif, vəzn, qafiyə, mövzu etibarı ilə Füzulinin eyni “Bax” rədifli

yaranmasında Qazi Bürhanəddinə Nəsiminin təsiri olmuşdur. Qazi Bürhanəddinin hürufiliyi təbliğ edən, Həllac Mənsurdan bəhs edən beytlərində bunu görmək mümkündür. Nəsimi 9 beytlik “Bax” rədifli qəzəlində dünyaya təsəvvüfi baxış, hürufiliyin təsiri özünü göstərməkdədir. Müəllif oxucunu hər şeyin mahiyyətinə baxmağa, ruhunu görməyə çağırır, insanın üzündə təcəlli edən Yaradandan danışır:

Aç bu sərapərdəyi, gir içəri, canə bax.
Gör nə təcəlli qılur, pərtövi-cananə bax.

Dost gözündə görüb sürməyi könül gözü,
Eşq ilə ondan dönüb təl’əti-sultanə bax

Əksini gör ol üzün istər isən görməyə,
Can ilə canan gözün ayineyi-canə bax. (26, s.505).

Nəsimi beytlərində bir sıra hallarda ikinci misrada deyilən fikir birinci misrada deyilən mətləbi təsdiqləyir, sübut edir:

Gözlərinin ayəti əksi əyan göstərir,
Dilər isən görməgə surəti-insanə bax (25, s.505).

Qazi Bürhanədinin eyni rədifli qəzəlindəki beytlərdə də birinci misrada deyilən fikir, ikinci misrada təsdiqlənir, inkişaf etdirilir:

Sahiri isdər isən gəl gözə-göz bu gözə bax,
Günəşi gördüm der isən, yüzə-yüz bu yüzə bax (26, s.250).

Beyt misraları arasındakı belə münasibəti Kişvərinin eyni rədifli qəzəlində də görə bilərik:

Könlümün viranəsindin bir nəfəs çıxmaz qəmin,
Gənci-dövlət yeri bolğan guşeyi-viranə bax...

Adəmiliğdin keçibmən pərivəş eşqidin,
Adəmi sanur məni, zahidi-heyvana bax...

nəzirə yazdığı üç Süruri qəzəlindən bəhs etmişdir ki, onlar barədə qısa məlumat vermişik.
Tədqiqatçı Zəkulla Bayramlı şairin birinci və ikinci qəzəllərinin diqqətəlayiq cəhətləri barədə yazır: "Fikrimizcə, "kəmənd, bənd-bənd, dərdmənd, cayi-pənd" və b. sadə və mürəkkəb sözlərdən düzəlmiş özünəməxsus qafiyələr, bir misrada "Allah-Allah" nidasının işlədilməsi, ümumən qəzəldəki fikir və xəyal zənginliyi və orijinal təşbeh-məcaz növləri birinci qəzəli fərqləndirən və başqa şairləri ona nəzirə yazmağa vadar edən səbəblər kimi qeyd olunmalıdır. İkinci qəzəldə isə "peyda, mə'va, tamaşa, mütərra, şəhla, molla" kimi ərəb və fars sözlərinin II şəxsin təkində əmr şəklində inkar formasında işlənərək, türk dilinin qrammatik qanunlarına tabe etdirilməsi ilk olaraq diqqəti çəkən məqamlardandır. Eyni zamanda, burada da I qəzəldəki kimi, cəsarətli bənzətmə və məcazlar üzərində qurulmuş ümumi məzmun və ideya oxucunu valeh edir. Ənənəvi təşbeh, epitet və başqa bədii təsvir vasitələrinin Süruri qəzəlində başqa şairlərdəkindən az da olsa fərqli şəkildə işlənməsi isə ayrıca qeyd olunmalıdır" (24, s.192).
H.Araslının Füzulinin nəzirə yazdığı Süruri qəzəli kimi göstərdiyi "Bax" rədifli şeirə münasibətimizi bildirmək istərdik. Qeyd edək ki, Z.Bayramlı tədqiqatçılar tərəfindən az araşdırılmış bu qəzəli məqaləsində ayrıca nəzərdən keçirmişdir (24, s.193-196). Z.Bayramlı həmin Süruri qəzəlinin Füzulinin diqqətini aşağıdakı cəhətlərinə görə cəlb etdiyini qeyd edir: "Füzulidə maraq doğuran Sürurinin bu qəzəli özünəməxsus bədii təsvir və poetik fiqurlar, həmiçinin orijinal dil-üslub özəllikləriylə də seçilir" (24, s.194). Füzulinin Süruri əsərlərindən təsirləndiyini, onun qəzəllərinə nəzirə yazdığını bir daha təsdiq etməklə xatırlatmaq istərdik ki, anadilli poeziyamızda "Bax" rədifli qəzələ daha əvvəlki dövrlərdə yaşamış şairlərimizdən, Nəsimi, Qazi Bürhanəddin və Kişvərinin divanlarında da rast gələ bilərik. Nəsiminin (1369-1417) adını ondan daha əvvəl dünyaya gəlmiş Qazi Bürhanəddinin (1344-1398) adından öncə çəkməyimizin səbəbi odur ki, fikrimizcə, bir sıra şeirlərinin, eləcə də "Bax" rədifli qəzəlinin

baxmayaraq sənətinin ucalığından əmin olduğunu da bildirir ki, Süruri divanının əlimizə natamam çatmış dibaçəsində bu yoxdur. Böyük şair vətəninin İraqi-Ərəb olduğunu ona görə vurğulayır ki, bura əvvəllər Səfəvilər dövlətinin, sonra isə Osmanlı imperatorluğunun əyaləti olub, mərkəzdən kənarda yerləşib. Füzulinin səyahət etməməsindən danışmasının da səbəbi vardır. Orta əsrlərdə cəmiyyətin müxtəlif təbəqələrinin nümayəndələri, xüsusilə də ziyalıları arasında belə hesab olunurdu ki, səyahətlər insanın şəxsiyyət kimi yetişməsi, dünyagörüşünün inkişaf etməsi üçün çox vacib şərtdir. Tədqiqatçılar göstərirlər ki, orta əsrlərdə Baba Kuhi Bakuvi, Qətran Təbrizi, Xətib Təbrizi, Fələki Şirvani, Xaqani Şirvani, Mücirəddin Beyləqani, Zülfiqar Şirvani, İmadəddin Nəsimi kimi klassiklərimiz çoxsaylı səyahətlər etmiş, gəzdikləri ölkələrin mədəniyyəti, elmi, ədəbi mühiti, ayrı-ayrı sənətkarları ilə tanış olmuş, mədəni, ədəbi əlaqələrimizin inkişafında mühüm rol oynamışlar (22). Sadiq bəy Əfşar (1533-1610) səyahət etməyi insanın formalaşmasında vacib amil kimi dəyərləndirirdi. “Məcməül-xəvas” adlı təzkirəsində o, Mövlana Heydəridən danışarkən dəfələrlə Hindistana gedib-gəlməyin şairin inkişafında mühüm rol oynadığını xüsusi qeyd edərək yazır: “Əlbəttə ki, səfərlər etməyin, insanları görməyin təsiri çox böyükdür” (23, s.256). Həmin əsərində müəllif Mövlana Möhtəşəm adlı şairin ünsiyyətdə təcrübəsizliyini onun səfərlərdə olmaması ilə izah edir: “Lakin səfərlərdə olmadığından ünsiyyət qanun-qaydalarında bir qədər təcrübəsizlik göstərirdi” (23, s.179). Fikrimizcə, Füzuli divanının dibaçəsində bu məqama işarə etmişdir. Lakin bu deyilənlərlə bərabər qeyd etmək istərdik ki, Nizami, Füzuli kimi vətənini heç bir zaman tərk etməmiş böyük sənətkarların dahiyanə əsərlər yazması da ədəbiyyat tarixinin danılmaz faktı kimi qəbul edilir.

Tədqiqatçılar göstərirlər ki, Füzuli yaradıcılığının ilk illərində Nəsimi irsinin varisi kimi tanınan Süruri yaradıcılığından təsirlənmişdir. Ümumiyyətlə, orijinal yaradıcılıq dəst-xəttinə malik ustad sənətkar Süruri sənətindən bir sıra müasirlərinin və xələflərinin bəhrələndiyi danılmaz faktdır. Akademik Həmid Araslı Füzulinin bəhrələndiyi və

və tərkib və hüruf üzrə tərtib edib, bu övraqı cəm eylədi. Xətapuş olan əshabi-kəmaldan və hünərbin olan əhli-haldan rica edir ki, eybinə nazir olmayub, bəlkə qüsurun satir olub, məzbur onların qatında məzur və kəndulər əndullah məcur olalar" (18, 1b). Dibaçədən göründüyü kimi, şair gənclik illərində yazıb bir yerə toplamadığı şeirlərini sonralar dostlarının xahişi ilə toplayıb, ənənəvi qaydada, ərəb əlifbası hərflərinin ardıcıllığı üzrə səliqə ilə düzmüş, bir divan tərtib etmişdir. Süruridən sonra ədəbiyyata gəlmiş böyük Azərbayacan şairi Məhəmməd Füzulinin türk divanının dibaçəsində bu toplunun meydana çıxması barədə dediyi sözlər Sürurinin dibaçəsini xatırladır. Füzuli deyir ki, bir gün bir nəfər ona müraciət edib türkcə şeirlərini bir toplu halında tərtib etməsini xahiş edir.Fikrini belə izah edir ki, şairin ərəbcə və farsca şeirləri toplu halında oxucuların əlində olduğu halda, türkcə şeirləri ortada yoxdur. Bu fikri qəbul edən Füzuli bildirir ki, türkcə şeirlərimdən müxtəsər divan tərtib etmək üçün gəncliyimdə xahişlə məndən şeirimi alanlardan xahiş edib onlarda olan şeirlərimi götürüb köçürdüm: "Naçar məhmili-etibarimdə bu ibarə lazımdır deyib zəmani-tüfuliyyətimdə sadir olub, mütəfərriq olan qəzəllərdən bir müxtəsər divan cəm etmək səlahin gördüm. Və ol vəqtdə məndən iltimasla alanlardan iltimsla alıb surəti-cəm'i, ixtisar üzrə itmamə yetirdim. Ümiddir ki, ərbabi-fəsahət və əshabi-bəlağət müşahidə və mütaliə qaldıqda, mənşə və mövlidim İraqi-Ərəb olub, təmamiyi-ömrdə ğeyr məmləkətlərə səyahət qılmadığımdan vaqif olduqda, bu illəti mucibi-süquti-etibar bilməyələr. Və məhəllü məqamimə görə rütbeyi-istedadimə həqarət ilə nəzər qılmayalar. Zira e'tibari-vətən isteda'di-zatə təsir etməz və topraqda yatmaq ilə tiladən cila getməz" (21, s.31).

Beləliklə, Füzuli divanının dibaçəsində Sürüri kimi anadilli divanını oxucuların xahişi ilə tərtib etdiyini, gəncliyində yazdığı şeirlərini müxtəsər divan halında topladığını bildirir. Füzuli də dibaçəsinin sonunda divandakı nöqsanlara görə üzrxahlıq edir, hətta bu nöqsanları düzəldəcək şəxsə əvvəlcədən minnətdarlığını bildirir. Lakin Füzuli məkanının İraqi-Ərəb olduğuna və heç bir yerə səyahət etmədiyinə

Sultani-bərrü bəhr Süleyman bin Səlim,
Qıldı hilali Rəxşünə nə’li-dəvab eyd (19, s.417).

Bu fikri osmanlı müəllifi Məhəmməd Sürəyya özünün “Sicilli-osmani, yaxud təzkireyi-məşahiri-osmaniyyə” adlı əsərində də təsdiq edir. O, şair barədə yazır: “Əcəm diyarından olub Ruma hicrət etdi. Əvaxir səltənəti-Sultan Süeyman xan Qanuniyə yetişdi. Şairdir. (20, s.12).
Süruri divanının 120 vərəqdən ibarət Kaliforniya nüsxəsinə 424 türkcə qəzəl, qəsidə, qitə, lüğəz (müəmma), mətlə və müfrədlər, həmçinin farsca şeirlər daxildir. Hər səhifə 15 sətirdir. Qeyd edək ki, bu nüsxədəki 424 qəzəldən 215-i 65 şairin şeirlərinə yazılmış nəzirələrdir. Bildirmişdik ki, Sürurinin qəzəllərinə Məhrəmi, Şəm’i, Zati, Vəsfi, Rəvani, Məsihi, Nitqi və s. osmanlı şairləri nəzirə yazmışlar. Şairin divanının haqqında danışdığımız nüsxəsində isə onun Nicati, Zati, Xəyali, Əhməd Paşa, Bahari, Fəqiri, Nişati, İshaq Çələbi, Cəfər Çələbi, Nizami, Saleh Çələbi, Rəvani, Məsihi, Cümhur, Qubari, Ənvəri, Fədayi, Ahi, Zəifi, Ədhəmi, Nəti, Mərdümi, Mühibbi, (Sultan Süleyman), Vəsfi, Nuri, Səlimi (Sultan Səlim), Nihali, Şeyxi, Nəvai, Sün’i, Heyrəti, Yəhya, Məhrəmi, Ruhi, Aftabi, Üzri, Safi, Şövqi, Səidi, Ləm’i, Lamei Çələbi, Hilali, Cəlili, Niyazi, Ədni, Həlaki, Rəfiqi, Cəfayi, Cəvani, Şahidi, Vüsali, Şəm’i, Şairi, Vəfayi, Niqabi, Qədri Əfəndi kimi osmanlı şairlərinin qəzəllərinə yazdığı nəzirələr vardır. Bu isə o deməkdir ki, Süruri Türkiyəyə köçdükdən sonra osmanlı ədəbi prosesində fəal iştirak etmişdir. Onun osmanlı şairlərinin yaradıcılığına güclü təsir etməsi, burada müqtədir sənətkar kimi tanınması barədə təzkirələrdə məlumatlar vardır. Öz əli ilə köçürüyü divanının dibaçə hissəsində Süruri gənclik illərində yazdığı şeirlərini sonralar dostların xahişi ilə bir divan halında topladığını bildirir. Həmin dibaçədə oxuyuruq: “Əhli-dillərin püreyb və qüsuri bəndeyi-kəmini-Xuda Süruri əvaili-eşq və cəvandə bəzi əşar inşa və xeyli kəlimat imla eyləmiş, likən aləmi-itlaqdə biqeyd olub, cəm’ə müqəyyəd olmayub, neçəsi zaye və nüsxeyi-qeyr şaye olmuş, haliyən fərmani-yaran və tələbi-xəllaq ilə mövcud olanı və hazır bulunanı cəm

bir divan halında tərtib etməsinin səbəbini açıqlayır, oxucuların buradakı nöqsanlara göz yumacağına ümid etdiyini bildirir. Divanda şairin gəncliyində və yaşlı vaxtı yazdığı şeirlər toplanmışdır. Buradakı şeirləri onların şairin divanının digər nüsxələrində və cünglərdə, məcmuələrdə rast gəldiyimiz variantları müqayisə etdikdə sözlərdə fərqlərin olduğunu görsək də, vəzn və qafiyə eynidir. Görünür ki, müəllif bir sıra şeirlərinin üzərində sonralar yenidən işləmişdir. Belə bir fikir irəli sürmək olar ki, divanın dibaçəsini, bütövlükdə, divanı başqa bir katib də köçürə bilərdi. Lakin divanın müəllif tərəfindən köçürülməsinin bir dəlili də odur ki, səhifələrin kənarında mətndə gedən səhvlər düzəldilmiş, hansı qəzəlin kimin şeirinə nəzirə olduğu göstərilmişdir. Nəhayət, divanın sonunda "təmmət" sözündən sonra katibin adı qeyd edilməmişdir. Görünür, müəllif buna ehtiyac hiss etməmişdir. Əgər gözəl nəstəliq xətti ilə yazılmış bu divanı başqa bir katib köçürsəydi, adını mütləq qeyd etməli idi. Beləliklə, Sürurі divanının Kaliforniya Universiteti kitabxanasında saxlanan nüsxəsinin aftoqraf olduğunu sübut edən bir neçə ciddi dəlil vardır.
Bu divan əlyazmasının köməyi ilə Sürurinin Osmanlı imperatoru Sultan Səlimin (1512-1520) oğlu Sultan Süleymanın hakimiyyəti illərində də (1520-1566) yaşadığını dəqiqləşdirə bilirik. Şairin divanının Kaliforniya nüsxəsinin əvvəlində onun Sultan Süleymana həsr etdiyi "Asiman" rədifli qəsidəsində belə bir beyt vardır:

Aftabi-səltənət Sultan Süleyman kim, ana
Yerü gög əhli ki, edər dualar asiman (18, v.2b).

Bu məlumat osmanlı müəllifi Aşiq Çələbinin hicri 976-cı ildə (m.1568-1569) yazdığı "Məşairüş-şüəra" təzkirəsində nümunə gətirdiyi Sürurinin

Səlx oldı mahi-ruzəvü göstərdi tab eyd,
Ərz eylədi cahana tamam aftab eyd

-mətləli qəsidəsindəki aşağıdakı beytinin verdiyi bilgini təsdiqləyir:

Şahbazi-laməkanın aşiyanıdır könül.

Könlümü zülfinlə çək zəncirə, şeydalanmasın,
Sinəmi çak et ki, səndən özgə məvalanmasın

Bu bir daha sübut edir ki, Vaikanın Apostol kitabxanasından (eləcə də haqqında danışacağımız digər kitabxanalardan) sürəti əldə edilmiş divan osmanlı müəlliflərinin "Süruriyi-Əcəm", "Süruriyi-Şərqi" adlandırdıqları şarimizə aiddir.

Sürurinin İstanbulun Süleymaniyyə kitabxanasında, 3777-ci nömrə altinda saxlanan anadilli divanı 26 vərəqdə köçürülmüşdür, 661 beytdən ibarətdir. Buraya 90 qəzəl, 3 mürəbbe daxildir.

Manisa şəhəri kitabxanasında 7844-cü nömrə altında saxlanan, 37 vərəqdən ibarət nüsxə isə məcmuədir. Əlyazmanın 23 vərəqində Sürurinin Azərbaycan türkcəsindəki şeirləri, sonrakı yerlərdə Nəsimi və "Dana" təxəllüslü Mir Seyid Əli adlı şairin farsca şeirləri köçürülmüşdür. Əlyazmada katib qeydi vardır. Süruri divanının qurtardığı səhifədə oxyuruq: "Təmam gəşt in divane-şərif fi-yövme-düşənbə fi mahe-məhərrəm əlhəram min şühur səneyi-səmanə və səb'in və tis'ə miə fi-şəhri Hələb fi-astane-Bayram Baba qəddəsə sirruhul əzüzül-əlfəqirül həqir Dərviş Mustafa bəndeye-Müctəba" (17, v.24b). Buradan məlum olur ki. Süruri divanının Manisa nüsxəsi hicri tarixlə 987, miladı tarixlə 1570-ci ildə Hələb şəhərində Bayram Baba adlı şeyxin dərgahında Dərviş Mustafa adlı katib tərəfindən köçürülmüşdür. Bu əlyazmadakı Süruri divanının digər nüsxələrində rast gəlmədiyimiz şeirlər, o cümlədən, Şah İsmayıl Xətaiyə həsr edilmiş mürəbbe böyük maraq doğurur.

Nəhayət, Süruri divanının ən son zamanlarda ABŞ-ın Kaliforniya Universitetindən (№327) əldə edilmiş aftoqraf nüsxəsi (buraya şairin Azərbaycan türkcəsi ilə bərabər farsca şeirləri də daxil edilmişdir) onun həyat və yaradıcılığı barədə bir sıra dəyərli məlumatlar əldə etməyimizə kömək edir. Digər nüsxələrlə müqayisədə daha kamil olan Kaliforniya nüsxəsinin şairin öz əli ilə köçürüldüyünü sübut edən dəlillər aşağıdakılardır: Müəllif divanının dibaçə hissəsində şeirlərini

Kişvəri, bir cür'ə içsən, yoxdur ölməklik sana,
Cami-zərdin Şah İsmaili-Sultan əlkidin (16, s.35).

Buradan belə bir nəticəyə gəlmək olar ki, şair Ağqoyunlu dövlətinin süqutundan sonra, XVI əsrdə də yaşamış, Şah İsmayil Xətaiyə qəzəl həsr etmiş, bəlkə də ömrünün son illərindəSələvilər sarayına yaxın olmuşdur. Tədqiqatçıların göstərdiyi kimi, istedadı xüsusilə qəzəl janrında yazdığı şeirlərdə özünü göstərən (7, s.216) Sürurinin son zamanlar əldə edilmiş divan nüsxələri də onun həyat və yaradcılığı barədə daha ətraflı danışmağa imkan verir. Həmin divan nüsxələrini nəzərdən keçirək. Vatikanın Apostol kitabxanasında Borgiturk. 35-şifri altinda saxlanılan Süruri divanının başlığı belədir. "Divani-Süruriyi-Əcəm". Məlumdur ki, bəzən şairimizi başqa sənətkarlardan fərqləndirmək üçün mənbələrdə onun bu cür və ya "Süruriyi-Şərqi" kimi adlandırmışlar. 192 vərəqlik əlyazmanın 184 vərəqində şairin anadilli şeirləri nəstəliq xətti ilə köçürülmüşdür. Nüsxə rikabə üsulu ilə-Şərq paginasiyası ilə səhifələnmişdir. Yəni, səhifələr rəqəmlə göstərilməmiş, hər səhifənin sonunda növbəti səhifədə yazilacaq ilk söz qeyd edilmişdir. Bu səhifələnmə üsulunun qüsurlu cəhəti ondan ibarətdir ki, ortadan neçə səhifənin düşürdüyünü bilmək mümkün deyil. Qeyd etdiyimiz kimi, əlimizə 184 vərəq həcmində çatan divandan naməlum sayda səhifələr düşmüş, bir sıra şeirlər natamam qalmışdır. 6 və ya 5 misradan ibarət səhifələrdən bəziləri oxunmaz hala düşmüşdür. Bəzi səhifələrin kənarında xalq təbabətinə dair müxtəlif qeydlər, əlyazmanın sonunda mətnə aid olmayan yazılar köçürülmüşdür. 931 beyti əlimizə çatmış bu divan nüsxəsində lətifi, Qınalızadə. Aşiq Çələbi təzkirələrində İsmayıl Hikmətin "Azərbaycan ədəbiyyatı tarixi" kitabında Azərbaycan şairi Süruriyə aid edilən aşağıdakı mətləli şeirlər aşkar edildi:

Çeşmi-pürxunimdə xalin nəqsi, ay arami-can,
Miskə bənzər kim, qızıl valadə olmuşdur nihan...
Ta ki, sevdaya-səri-zülfün məkanlıdır könül,

Süruri haqqında mənbələrdə verilən məlumatlar əsasında belə qənaətə gəlmək olar ki, XV-XVI əsrlərdə yaşamış bu Azərbaycan şairi dövrünün güclü sənətkarlarından olmuş, əsərləri müasirlərinin yaradıcılığına təsir etmişdir. Rəvan və axıcı dillə şeirlər yazan Sürurinin anadilli lirik şeirlər toplusu-divanı məşhur olmuşdur. İsmayıl Hikmət şairin Çaldıran döyüşündən sonra Türkiyəyə köçdüyünü, orada çox yaşamadığını, ən geci h.926 (m.1519-1520) vəfat etdiyini göstərir.
Sadalanan faktlar əsasında Sürurinin həyatını şərti olaraq üç mərhələyə bölmək olar: 1)Şairin XV əsrdə yaşadığı həyatının birinci mərhələsi. Bu dövr haqqında məlumatımız, demək olar ki, yoxdur; 2) I Şah İsmayıl hakimiyyətə gəldikdən sonra Səfəvilər sarayına yaxın olduğu mərhələ. Bu mərhələ barədə bildiyimiz odur ki, hakimiyyətinin ilk dövründə I Şah İsmayıl onun hakimiyyətə gəlməsinə yardım etmiş hürufilərə, o cümlədən, Süruri, Tufeyli kimi şairlərə qayğı ilə yanaşmışdır; 3) Üçüncü mərhələdə şair Türkiyəyə köçmüş, istedadlı, qüdrətli şair kimi tanınmış, buranın ədəbi prosesində iştirak etmiş, yerli şairlərin yaradıcılığına təsir göstərmişdir.
Mənbələrdə orta əsrlərdə yaşamış şair və yazıçılarımız, alim və müxtəlif peşə sahiblərimiz barədə kifayət qədər məlumat yoxdur. Belə bir vəziyyətdə klassiklərimizin əsərləri, dünyanın müxtəlif kitabxanalarında saxlanan şeir topluları, divanları köməkçimiz olur. Məsələn, son dövrlərə qədər özbək şairləri Lütfi və Əlişir Nəvai, osmanlı şairləri Əhməd Paşa və  Karamanlı Nizami şeirlərinə təxmislər yazan Azərbaycan şairi Kişvərinin Ağqoyunlu sarayına yaxın olduğu, XV əsrdə yaşadığı barədə bilgimiz vardı. Kişvərinin Məclise-Şuraye-İslami Kitabxanasında saxlanan, öz əli ilə köçürdüyü aftoqraf divanı onun tərcümeyi-halı haqqında yeni məlumat verir. Şairin bu divanındakı

Ey müsəlmanlar, fəğan bir namüsəlman əlkidin,
Namüsəlman demə kim, bir afəti-can əlkidin (16, s.35)

-mətləli 7 beytlik qəzəlinin məqtə beytində oxuyuruq:

misrasıyla başlanan qəzəlindən söz açır, bu qəzələ Sultan Süleymana (1520-1566) mədhiyyə yazan bir sıra osmanlı şairləri tərəfindən təxmislər yazıldığı barədə məlumat verir: “... qəzəli şair və sənətdəki qüdrət və məharətinə canlı bir vəsiqədir. Eyni qəzəlin Qanuni Süleyman madihlərindən olub Qanuninin h.926-cı ildə (m.1520) cülisindən başlayaraq h.941-də (m.1534) Bağdadı fəthinə qədər keçən zamanını və zəfərlərini nəzm edən şair Məhrəmi tərəfindən təxmisi vardır ki, o təxmisdə də yanlışlıqla qəzəl Sultan Səlimə ətf olunmaqdadır. Qəribədir ki, “Məcmuətün-nəzair” sahibi əsərində qəzəli Sürurimə aid olaraq göstərdiyi halda, təxmisin Səlimə ətf edildiyinin fərqinə varmamışdır.
Zamanında məsnəviləri ilə məşhur olan Məhrəmi Sürurinin qəzəlini böylə təxmis etmişdir:

Ey gözəllik bağı içrə tazə sərvi-sərbülənd,
Görmədi qəddin kibi bir nəxli-gül heç nəxlbənd,
Zülfünün hər bir qılında bağlıdır yüz müstəmənd,
“Ta müənbər kakilin xurşidə salmışdır kəmənd,
Bağlamışdır boynumu zənciri-zülfün bənd-bənd”...

Məhrəmi, səd xəncəri-hicran ilə ol simtən,
Qət’ edərsə başını, qət’ən yüzün döndərmə sən,
Anın için kim, nədir gör Xosrovi-mülki-süxən,
“Ey Səlimi, xətt sevdasından anın baş çəkən,
Parələnsün tiği-möhnətdən gələn tək bənd-bənd”.

Bu təxmisdən başqa Şəmi, Zati, Vəsfi, Rəvani, Məsihi eyni vəzndə olaraq, Nitqi də daha müxtəsər bir vəznlə tənzir etmişlər. Hətta Rəvani, Məsihi və Nitqi qəzəllərinin sonunda Kəmal Xocəndiyə təlmih ilə birər şairanə təməddühdə də bulunmuşlardır. Bu təlmih ilə Kəmal Xocəndinin də bu məal və qafiyədə bir qəzəli olduğunun da ehsas etmiş olurlar. “Məcmuətün-nəzair”in göstərdiyinə görə, bütün bu şairlərin Sürurimə nəzirə yazmaları onun şairlikdəki mövqeyi haqqında müsbət bir fikir vermək üçün kafidir” (15, s.261-263).

Cəzbeyi-zülfü bəni durmaz çəkər qullabtək.

Arizi sanman ki, zatidir könüldə nari-eşq,
Atəşim sudan söyünməz laleyi-sirabtək" (13, s.414-415).

Osmanlı müəlliflərindən Aşiq Çələbi (1520-1572) "Məşairüş-şüəra" adlı təzkirəsində Sürurinin Diyari-Əcəmdən (Azərbaycan və İran) Osmanlı dövlətinə gəldiyini, bir sıra elmlərdən xəbərdar olduğunu bildirmiş, onun "Ta ki, sevdayi-səri-zülfün məkanıdır könül", "Çeşmi-pürxunumda xalın əksi, ey arami-can", "Səlx oldu mahi-ruzəvü göstərdi tabi-eyd" misraları ilə başlanan qəzəllərindən nümunələr vermişdir. XVI əsrdə yaşamış digər müəllif Qınalızadə Həsən Çələbi (1546-1604) 1586-cı ildə tamamladığı "Təzkirətüş-şüəra" əsərində şair haqqında yazır: "Vilayəti-Əcəm"dəndir. Sultan Səlimi-mazinin zamanında fövt olub. "Bu dünyanın, Süruri, filhəqiqə, eyni-şərvərdir" deyü diyari-üqbadə sürur olmaq qəsdilə sər vermişdir. Və bu aləmi-fənadə namurad olmaqla muradi-həqiqiyə irmişdir. Əgərçi əşarı bişümardır, lakin layiqi-qəbul bəzi mətale vardır. Bu şeir anındır:

Dideyi-pürnəmdə xalın əksi, ey arami-can,
Miskə bənzər kim, qızıl valadə olmuşdur nihan (14, s.406-407).

Görkəmli türk alimi İsmayıl Hikmət Ertaylan 1928-ci ildə Bakıda nəşr etdirdiyi "Azərbaycan ədəbiyyatı tarixi" kitabında Süruri barədə təzkirələrdə rast gəldiyi məlumatları nəzərdən keçirərək onu XV-XVI əsrlərdə yaşamış, özünəməxsus üsluba, istedada malik qüvvətli şair, divan müəllifi kimi səciyyələndirmişdir. Alim onu Şərq ədəbiyyatının formalaşmış qəlibləri, klişeləri çərçivəsində hisslərini ifadə edə bilən, ədəbiyyata yenilik gətirən sənətkar kimi təqdim edir: "Şairin ifadəsində çox coşqun olmasa da bir rübabilik, bir hissilik var. Klişe olan o təbirlərin, o istiarələrin içində bir könül sığışdırmağa, bir hiss gizlətməyə çalışır (15, s.260). İ.Hikmət Sürurinin sənətkarlığından danışarkən onun "Ta müənbər kakilin xurşidə salmışdır kəmənd"

yazmış osmanlı müəllifi Sürurinin əsərləri bəziləri tərəfindən bizim şairimizə aid edilmişdir. Azərbaycan şairi Süruri barədə bəzi mənbələrin qeydlərini nəzərdən keçirək. Osmanlı müəllifi Səhi bəy (?-1548) 1538-ci ildə tamamladığı "Həşt behişt" təzkirəsində şair barəsində "Sultan Səlim dövründə, Şah İsmayıl vəqtində fövt oldu" yazaraq onun yaşadığı dövr barədə təxmini məlumat vermişdir (12, s.19).

Qəstəmonulu Lətifi (1491-1582) 1546-cı ildə tamamladığı təzkirəsində şairi "Süruriyi-Şərqi" adlandıraraq onun Sultan Səlim və I Şah İsmayıl vaxtında Çaldıran döyüşündə həlak olduğunu, bəzilərinin onu rumlu (osmanlı) hesab etdiklərini göstərmişdir. Həmin təzkirədən Süruriyə aid bir hissəni professor Mustafa İsenin dilini sadələşdirdiyi variantda təqdim edirik: "Son dərəcə gözəl qəzəlləri və müxəyyəl şeirləri vardır. Qəzəl tərzində eşsiz olub bənzəri yoxdur.

"Ta müənbər kakilün xurşidə salmışdır kəmənd" misrasıyla başlanan qəzəl bəzi qaynaqlarda Sultan Səlimə isnad edilir. Halbuki, onun şeirlərindəndir. Onun divanında yer alması ilə bərabər dərvişcə tərzi də bu xüsusu sübut edir.

Digər:

Çeşmi-pürxunumda xalın əksi, ey-arami-can,
Miskə bənzər kim, qızıl valada etmişlər nihan,

Bu hay-küyə səbəb olan qəzəl də onun şeirlərindəndir:

Qamətim qəmdən büküldü sünbüli-pürtabtək,
Gözlərim qan ilə doldu laleyi-sirabtək.

Cəng için hər dəm dili-xaradən ol sərvi-rəvan,
Daş saxlar sineyi-simin içində abtək...

Müəllifin (Lətifinin-P.K.) nəzirəsi:
Qamətim qəmdən büküldü dərd ilə dolabtək,
Axdı göz-göz didədən əşki-rəvanım abtək.

Yarın ardınca yürürsəm ixtiyari sanmanız,

-misralarında gördüyümüz bu xüsusiyyətlər onun adını klassik qəzəlnəvislər sırasında yüksəldir.

Füzuli yaradıcılığının ilk illərində Sürurinin bəhs etdiyimiz hər üç qəzəlinə nəzirə yazmışdır.

Öylə yandım atəşi-eşq ilə kim, sanır görən,
Rişteyi-şəm'əm ki, oddandır mənim pirahənim

- beytindəki mübaliğə,

Yar əğyarü fələk qəddarü dil biixtiyar,
Ey Süruri, nolasıdır aqibət halım mənim

beytindəki orijinallıq şairin klassik poeziyamızda tutduğu yüksək yeri və müasirlərinə təsirinin səbəbini aydınlaşdırır" (10, s.58-59).

XVI əsrdə "Süruri" təxəllüslü bir neçə şair olduğundan bəzən bu şairləri bir-biri ilə qarışdırırlar. Ehtimal ki, I Sultan Səlim 1514-ci ildə Çaldıran döyüşündən sonra bizim Sürurini də digər sənətkarlarla birlikdə Türkiyəyə aparmışdır. Onun Türkiyədə böyük nüfuz qazandığı, osmanlı şairlərinə təsir etdiyi, orada vəfat etdiyi göstərilir. Professor Azadə Musabəyli "Türkiyədə yaranan Azərbaycan ədəbiyyatı və Xəlilinin "Firqətnamə"si" adlı kitabının "Azərbaycandan Türkiyəyə gedən sənətkarlar və onların əlyazmaları" adlı birinci fəslində ayrı-ayrı təzkirə və əlyazmalarda rast gəldiyi Süruri şeirlərini təhlil etmiş, onlardan nümunələr vermişdir. A. Musabəyli AMEA Əlyazmalar İnstitutunda, Sankt-Peterburq Universiteti kitabxanasında saxlanan əlyazmalara, İsmayıl Hikmətin "Azərbaycan ədəbiyyatı tarixi" kitabında verilən şeirlərin mətninə əsasən Lətifi təzkirəsində deyilən fikri təsdiqləyir, bəzi müəlliflərin Sultan Səlimə aid etdiyi " Ta müənbər kakilin xurşidə salmışdır kəmənd" misrasıyla başlanan qəzəlin Süruriyə məxsus olduğunu göstərir (11, s.19). Qeyd etdiyimiz kimi, mənbələrdə "Süruri" təxəllüslü ədiblər bir-biri ilə qarışdırılmış, klassik şairlərdən Mövlana Cəlaləddin Rumi, Əbdürrəhman Cami, Hafiz Şirazi əsərlərinə şərhlər

Azərbaycan şairidir. Sürurini Nəsimi irsinin varisi, onun ideyaları uğrunda mübarizə aparan sənətkar adlandıran akademik Həmid Araslı "Böyük Azərbaycan şairi Füzuli" monoqrafiyasında qeyd edir ki, şair Xətai sarayında yaşayarkən hürufi fikirlərini yaymış, bununla bərabər dünyəvi məhəbbət mövzusunda da qəzəllər yazmışdır. Alim Sürurinin şeir sənətkarlığı barədə yazır: "...O, məhəbbət mövzularında da yazmış və bu cür qəzəllərində daha artıq müvəffəqiyyət qazanmışdır. Divanında təsadüf etdiyimiz qəzəllərdə onun ustad bir şair, Füzuliyə və bir çox müasirlərinə təsir edə bilən bir sənətkar olduğunu görürük. Hürufiliyi təbliğ etmək məqsədilə yazdığı şeirlərdə dili ərəb-fars tərkibləri, hürufi və dini ibarələrlə dolu olan və Nəsimi dilinə nisbətən daha çətin və şərhə möhtac görünən bu şairin aşiqanə qəzəlləri nisbətən sadə və orijinaldır" (10, s.58). H.Araslı Sürurinin aşağıdakı mətləli üç qəzəlini yüksək dəyərləndirərək. Füzuli də daxil olmaqla bir sıra sənətkarların yaradıcılığına təsir etdiyini, Füzulinin bu şeirlərə nəzirə yazdığını göstərir:

Ta müənbər kakilin xurşidə salmışdur kəmənd
Bağlamışdır boynumu zənciri-zülfün bənd-bənd...

Könlümü zülfünlə çək zəncirə, şeydalanmasın,
Sinəmi çak et ki, səndən qeyri məvalanmasın...

Bisütuni-qəmdə bərgi-laleyi-həmrayə bax,
Pərdəhayi-dideyi-Fərhadi-qəmfərsayə bax.

Alim birinci qəzəl haqqında yazır ki, əsrlərcə Yaxın Şərq şairləri ona nəzirələr yazmışlar: "Şeirin musiqisi, qafiyənin ona verdiyi əzəmət, xəyal dərinliyi, ifadə orijinallığı Süruriyə şöhrət qazandıran əsas xüsusiyyətlərdəndir:

Ənbərəfşan zülf ilə irmək dilər canə könül,
Allah-Allah, nə uzaq sövdayə düşmüş dərdmənd

qoyub getdiyi ədəbi-bədii mirasdan bəhrələndiyi kimi, Nəsiminin də şeirlərini oxumuş, onun priyomlarından istifadə etmiş, öz fikir və hislərini daha yeni və orijinal formada ifadə etmişdir, dərin biliyi və müstəsna istedadı, zəngin həyat təcrübəsi, orijinal üslubu ilə əbədi yaşayan gözəl əsərlər yaratmışdır" (9, s.124).

Füzuli də Nəsimi kimi "Oynar" rədifli qəzəl yazmışdır. İki sənətkarın qəzəllərindəki beytləri müqayisə etdikdə Füzulinin Nəsimidən təsirləndiyini əyani surətdə görmək mümkündür:

Nəsimi:
Nigarım, dilbərim, yarım, ənisim, munisim, canım,
Füzuli:
Gözüm, canım, əfəndim, sevgilim, dövlətli sultanım.
Nəsimi:
Çün Nəsimi aləmin sultandır,,
Dövr anın, dövran anın dövranıdır.
Füzuli:
Ol pərivəş kim, məlahət mülkünün sultanıdır,
Hökm onun hökmdürür, fərman onun fərmanıdır.

Qeyd etdiyimiz kimi, adlarını sadaladığımız dörd böyük sənətkarın-Nəsimi, Nəvai, Xətai və Füzulinin anadilli Azərbaycan ədəbiyyatının inkişafına güclü təsiri olmuşdur. Bu sənətkarlardan hər birindən və ya bəzilərindən bəhrələnən şairlərimiz də olmuşdur. Daha çox bir sənətkarın irsindən təsirlənənlər də vardır. Məsələn, Süruri, Tufeyli kimi XV-XVI əsrlərdə yaşamış hürufi şairlərin yaradıcılığında əsasən Nəsimidən bəhrələməni görürük. Tədqiqatçılar haqlı olaraq göstərirlər ki, dil və üslub cəhətdən Nəsimiyə yaxın olduqlarından əsərlərinin böyük Azərbaycan şairinin şeirləri ilə səhv salınması tamamilə mümkün olan şairlər də vardır: "XVI yüzillikdə yaşamış hürufi şairlərdən Süruri, Fazili, Kəlimi, Nəmayi kimi şairlərin əsərləri dil, üslub və istifadə edilən terminlər baxımından Nəsimi şeirinə səhv salınacaq qədər yaxındır" (7, s.247).

Süruri əsərlərində əsasən Nəsimi irsindən bəhrələnən, Nəvai sənətindən də müəyyən qədər təsirlənən, ədəbiyyata özündən sonra gəlmiş Füzuli yaradıcılığına təsir edən, XV-XVI əsrlərdə yaşamış

(1252-1334) olmuşdur. Lakin Səfəvi ideyalarını təbliğ edən türkdilli qızılbaş şeiri məhz Xətaidən sonra formalaşır və özünün ardıcıllarını tapır. Qızılbaş ədəbiyyatı, onun xüsusiyyətləri barədə danışarkən, əlbəttə ki, birinci növbədə bu ədəbiyyatın əsasını qoymuş Xətainin yaradıcılığından danışmaq lazımdır. Tədqiqatçılar haqlı olaraq qeyd edirlər ki, qızılbaşlıq ideyaları Xətai divanında daha aydın ifadəsini tapmışdır. Səfəvilik ideyalarını, şiəliyi təbliğ edən, döyüşə gedən qızılbaş əsgərlərini "igid yektalar", düşməni Yəzid, Şümri-Mərvan adlandıran Xətai qızılbaş ədəbiyyatının klassik nümunələrini yaratmışdır. Nəsiminin şeirindəki üsyankar, mübariz ruh Xətaiyə keçərək siyasi məna da kəsb etmişdir. Tədqiqatçı Səadət Şıxıyeva Xətainin Nəsimi irsindən bəhrələnməsi barədə yazır: "Nəsiminin hökmdar xələflərindən olan Şah İsmayıl Xətainin-Səfəvi xanəndanının bu ən qüdrətli hökmdarının qəzəllərinin böyük əksəriyyəti Nəsimiyə yazılmış nəzirələrdir ("Gör", "Anda neylər", "İdim", "Olmasın", "İçində", "Bilənə" və s.). Xətai şeiri sələfinin söz sənətindəki ruhunu yaşatması ilə Nəsimi ədəbi məktəbində xüsusi yer tutur" (7, s.246).
Nəhayət, Nəsimi sənətindən bəhrələnən, sələfi kimi üç dildə: türk, fars və ərəb dillərində mükəmməl əsərlər yaradan, müasirlərinin və özündən sonra gələn sənətkarların yaradıcılığına güclü təsir edən dahi şairimiz Məhəmməd Füzulidir (1494-1556). Mirzağa Quluzadə haqlı olaraq göstərir: "Nəsiminin lirikası Füzuli ədəbi istedadının yetişməsi üçün zəruri bir tarixi mərhələ təşkil edir. Bu iki sənətkar arasında bədii fikrin inkişafı nöqteyi-nəzərindən qanunauyğun bir əlaqə mövcuddur. Nəsimi və Füzuli Azərbaycan ədəbi-tarixi prosesinin bir-birini tamamlayan iki müxtəlif mərhələsidir. Nəsimi Azərbaycan dilində yaradılmış şeirin bünövrəsini işləyib divarlarını xeyli qaldırmışsa, Füzuli bu imarəti tamamlamaqla bərabər, onun bütün ziynətini vermişdir" (8, s.28). İki böyük sənətkarın ədəbi irsini müqayisəli şəkildə araşdıran tədqiqatçılar belə qənaətə gəlirlər ki, Füzuli Nəsimi əsərlərini diqqətlə oxumuş, onun ədəbi irsinə dərindən bələd olmuşdur. Tədqiqatçı Vəcihə Feyzullayeva yazır: "Şeirlərinin məzmunundan görünür ki, Füzuli özündən əvvəlki şair və ediblərin

soruşdu ki, kim daha yaxşı yazır, sən kimi daha çox bəyənirsən? Mən dedim:
-Mövlana Lütfi hamı tərəfindən bəyənilir...o, söz mülkünün sultanıdır.
O dedi:
-Nə üçün Seyid Nəsimini demədin?
Mən cavab verdim:
-Yadıma düşmədi, onu xatırlamaq da çətindir. Seyid Nəsiminin nəzmi başqa cürdür. O, bizim şairlər kimi yazmamışdır. Əsl həqiqəti təqdim edib. Bu sualı verməkdə sənin məqsədin rəmzi şeirlər yazanları soruşmaqdırmı?
Pəhləvan etiraz etdi və istehza ilə dedi:
-Heç rəvadır ki, Seyid Nəsiminin yanında Lütfiyə üstünlük verirsən? Halbuki Seyid Nəsiminin şeirləri zahirən məcazi olsa da, məna etibarı ilə əsl həqiqətin yolunu vəsf edir. Bunu deyib mənim bu gün səhər tezdən yazdığım şeiri əzbərdən, özünəməxsus bir ahənglə axıra qədər oxudu. Şeirin məqtəsində mənim təxəllüsüm var idi:

Gər Nəvai gözəllərin vəsfi üçün çəksə çoxlu əziyyət,
Nə etməli, bəxti qaraya hər zaman kədərdən pay düşür.

Məhəmməd Pəhləvan mənim təxəllüsümü Nəsimi ilə əvəz etmişdi. Əslində bu əvəzetmə yerinə düşürdü. Nəvaidən çox Nəsimiyə münasib gəlirdi...” (bax:6).
Ə.Nəvainin “Nəsaimül-məhəbbət” adlı əsərində də Nəsimi haqqında məlumata rast gəlirik. Nəvainin türkcə dörd divanından hər birində Nəsiminin təsiri ilə yazılmış şeirlər vardır. Tədqiqatçılar Nəvainin “Arzu”, “Kimdə var?” qəzəllərinin Nəsiminin “Arzular”, “Kimdə var?” şeirlərinə nəzirə olaraq yazıldığını göstərmişlər. Böyük özbək şairi Nəsiminin “Bu nə adətdir, ey türki-pərzad” misrasıyla başlanan şeirinə bir neçə nəzirə yazmışdır (7, s.246).
XVI əsrdən başlayaraq Azərbaycan ədəbiyyatında səfəvilik, qızılbaşlıq ideyalarını təbliğ edən poeziyanın mövcudluğundan danışa bilərik. Bu poeziya istər klassik, istərsə də şifahi xalq ədəbiyyatına məxsus formalardan istifadə etmişdir. Səfəviliyin ilk təbliğatçısı bu təriqətin banisi, Şah İsmayılın ulu babası Şeyx Səfiəddin Ərdəbili

Azərbaycan deyil, Türkiyə, İran, Türkmənistan, Özbəkistan və Tacikistanın müxtəlif söz sənəti ustaları da daxildir" (4, s.33).
Nəsimi şeirindən bəhrələnən, onun möhtəşəm poeziyasından ilhamlanan orta əsrlər özbək şairləri arasında Lütfi, Nəvai, Hüseyn Bayqara, Şeyxzadə Ətai, Əsiri, Məşrəb və başqalarının adını çəkmək olar. Özbək alimi Erqaş Rüstəmov yazır: "Nəsimi mənsub olduğu Azərbaycan xalqının, Yaxın Şərq və eləcə də özbək xalqının ədəbiyyatında mərdlik, cəsarət və qəhrəmanlıq rəmzinə çevrilmişdir. Nəsimi ədəbi irsi əsrlərdən bəri özbək şairlərinin yaraıcılığında həm məna və məzmun, həm də forma və ifadə tərzi cəhətdən silinməz izlər buraxmışdır. Dahi özbək şairi Əlişir Nəvai Nəsiminin həyatı və ədəbi fəaliyyəti ilə yaxından tanış idi (5). Məlum olduğu kimi, böyük özbək şairi Əlişir Nəvainin (1441-1501) Azərbaycan- özbək ədəbi əlaqələrinin inkişafında müstəsna rolu olmuşdur. O, orta əsrlər Azərbaycan ədəbiyyatı ilə ən çox bağlı olan və Azərbaycan şairlərinin yaradıcılığına ən çox təsir etmiş Orta Asiya şairidir. Nizami, Nəsimi, Əşrəf Marağayi, Qasim Ənvar kimi Azərbaycan şairlərinin əsərlərindən bəhrələnən, onların ədəbi irsinə böyük hörmət və məhəbbətlə yanaşan Nəvai bir sıra Azərbaycan şairlərinin-Kişvəri, Xətai, Füzuli, Sadiq bəy Əfşar, Əmani, Mürtəzaqulu xan Zəfər, Saib Təbrizi, Qövsi Təbrizi və başqalarının yaradıcılığına təsir etmişdir. Heç şübhəsiz, Nəvainin əsərlərinin orta əsrlərdə bir sıra türk xalqlarının nümayəndələri tərəfindən asanlıqla oxunub başa düşülməsi, əsərlərindəki humanizm ideyaları, dərin məna, yüksək sənətkarlıq onun yaradıcılığının geniş bir coğrafiyada-bütün Türküstandan başqa Azərbaycan, İran, Türkiyə və Hindistanda da yayılmasına səbəb olmuşdu. Nəvai "Nəsaimül-məhəbbət" və "Haləti-Pəhləvan Məhəmməd" əsərlərində Nəsiminin anadilli şeirlərini böyük hörmət və məhəbbətlə yad edir ki, bu da onun dahi Azərbaycan şairinin irsinə bələd olduğundan xəbər verir. Nəvai"Küştigir" təxəllüsü ilə şeirlər yazan Məhəmməd Pəhləvana həsr etdiyi bioqrafik mövzulu əsərində yazır ki, "bir dəfə bərk xəstələnmişdim. Məhəmməd Küştigir hər gün mənə baş çəkmək üçün yanıma gəlirdi. Bir gün o

müqayisədə daha üstün mövqeyə malik olmuşdur. Bir sıra elmi əsərlərin, hətta bəzi lüğətlərin belə nəzmlə yazıldığı bəllidir. Lakin nəzmlə yazılmış hər bir əsəri, təbii ki, poeziya nümunəsi hesab etmək olmaz. Ədəbiyyatşünaslıqda şeir dedikdə "müəyyən bir tarixi dövrün ədəbiyyatına məxsus şeir nitqi qanunlarına əsasən yaradılmış lirik və ya lirik-epik əsər" (2, s.385) başa düşülür. Şeirdə poetik fikir obrazlarla, vəzn və qafiyənin köməyi ilə ifadə olunur. Orta əsrlər Azərbaycan ədəbiyyatı tarixində lirik poeziya böyük əhəmiyyətə malik olmuşdur. Araz Dadaşzadənin bu fikrini tamamilə haqlı sayırıq: "Lirika orta əsr Azərbaycan poeziyasının canıdır. Cəsarətlə deyə bilərik ki, bütün Azərbaycan şairləri nədən və nə yazdıqlarından asılı olmayaraq lirik idilər" (3, s.21). Həyat hadisələrini təhkiyə yolu ilə əks etdirən eposdan, hərəkət, danışıq vasitəsilə əks etdirən dramdan fərqli olaraq lirikada gerçəklik müəllifin daxili aləmində yaranmış fikir və həyəcanları göstərməklə əks etdirilir.

Dörd böyük lirik sənətkar-İmadəddin Nəsimi, Əlişir Nəvai, Şah ismayıl Xətai və Məhəmməd Füzuli XV-XVI əsrlər anadilli Azərbaycan poeziyasının inkişafına, dövrün şairlərinin yaradıcılığına güclü təsir etmişlər. Bu dörd qüdrətli sənətkar arasında Nəsiminin mövqeyi xüsusilə diqqətəlayiqdir: Çünki Nəsimi (1369-1417) onunla bərabər adını çəkdiyimiz digər üç sənətkarın da yaradıcılığına kifayət qədər güclü təsir etmişdir. Tədqiqatçı Səadət Şıxıyeva Nəsimi irsinin müxtəlif dünyagörüşlü sənətkarların yaradıcılığına təsiri barədə yazır: "Onun mükəmməl bədii-fəlsəfi fikir sisteminin həm dövrünün, həm də sonrakı əsrlərin ədəbiyyatına dərin təsiri olmuşdur. Bu nüfuz dairəsi, bəzi tədqiqatlarda göstərildiyi kimi, yalnız hürufi və təriqət ədəbiyyatı ilə məhdudlaşmır. Şairin fərdi üslubundan təsirlənmə ələviliyin müxtəlif qolları ilə yanaşı xəlvətiyyə, gülşəniyyə, misriyyə və s. kimi fəlsəfi-fikri axınların mürşidlərinin və bir sıra təriqətlərin nümayəndələrinin (qələndərilər, yəsəvi dərvişləri və s.) yaradıcılığında da müşahidə olunur. Təriqət və divan ədəbiyyatı ilə yanaşı xalq şeiri üslubunda yaradılmış poetik örnəklər üzərində də Nəsiminin güclü təsiri duyulmaqdadır. Bu qeyri-məhdud nüfuz sahəsinə yalnız

şeiri şəkillərindən bəhrələndiklərini görürük. Əlbəttə, nəzərə almaq lazımdır ki, bu zaman artıq heca vəznində, xalq şeiri formalarında yazan Xoca Əhməd Yəsəvi, Əli və Yunus Emrenin örnəyi mövcud idi. XVI əsrdə yaşamış Şah İsmayıl Xətai sarayına yaxın olan Aşıq Qurbani əsərlərini şifahi xalq ədəbiyyatı şəkillərində, xalq şeiri ruhunda yaratmışdır.

Dövrün ədəbiyyatının məzmununda da dəyişikliklər nəzərə çarpırdı. Bu zaman əsasən ənənəvi növ və janrlar çərçivəsində mövcud olan Azərbaycan ədəbiyyatına yeni təmayüllərin gəlməsi dönməz xarakter almışdı. Ədəbiyyat, poeziya humanizmi, məhəbbəti, gözəlliyi təbliğ etməklə bərabər get-gedə daha artıq dərəcədə zamanın ümummilli əhəmiyyətli ictimai və etik problemlərinin diqqətə çatdırılması üçün vasitəyə çevrilir, xalqın milli özünüdərkində mühüm rol oynayırdı. Əsasən ümumbəşəri problemlərlə məşğul olan orta əsr tipli ədəbiyyat hakim mövqeyini saxlasa da, ədəbiyyatın ictimai, milli əhəmiyyəti nəzərə çarpacaq dərəcədə artmağa başlamışdı. Bu dövrdə digər türk məhəlli dillərindən, o cümlədən, osmanlıcadan və cığataycadan fərqi daha çox nəzərə çarpan Azərbaycan türkcəsi geniş bir ərazidə başa düşülürdü.

XV-XVI əsrlərdə bir sıra məmləkətlərdən Azərbaycana, Səfəvilər dövlətinə mühacirət edənlər olduğu kimi, Azərbaycandan, Səfəvilər dövlətindən xarici ölkələrə köçənlər də var idi. Türkiyə ərazisinə köçən Arifi, Bəsiri, Bidari, Qasimi, Matəmi, Mir Qədri, Pənahi, Səhabi, Süruri, Xəzani (Əsiri), Xəlifə, Hamidi, Hafiz, Niyazi, Haşimi, Şahi, Həbibi, Xəlili, Gülşəni kimi Azərbaycan şairlərinin adını çəkən professor Azadə Musabəyli təəssüflə bu sənətkarların bir çoxunun əsərlərinin əlimizə çatmadığını qeyd edir: “Təəssüflə etiraf etməliyik ki, anılanların çoxunun əsərlərinin topluları əlimizdə yoxdur. Elələri vardır ki, haqqında təzkirələrdən bir cümlə, bir ifadə tapmışıq və ya neçə-neçə əlyazmanı axtarıb-axtarıb bir şeirini, bir misrasını üzə çıxarmışıq” (1, s.77).

Məlum olduğu kimi, orta əsrlər Müsəlman Şərqi xalqlarının ədəbiyyatında, o cümlədən, Azərbaycan ədəbiyyatında poeziya nəsrlə

## Süruri və onun divanı

XV-XVI əsrlər Azərbayan xalqının tarixində, mədəniyyət, elm və ədəbiyyat tarixində çox mühüm əhəmiyyətə malik olan dövrdür. XV əsrin əvvəllərində Teymurun işğalına son qoyulduqdan sonra ölkənin ərazisində mövcud olan Şirvanşahlar, Cəlairilər, Qaraqoyunlular, Ağqoyunlular, Səfəvilər dövlətlərinin hakimiyyəti zamanı milli mədəniyyətin, elmin, ədəbiyyatın inkişafına xüsusi fikir verilməyə başlandı. Xüsusilə Səfəvilər dövründə ölkənin siyasi, hərbi, iqtisadi gücü xeyli artdı. 1501-ci ildə Şah İsmayıl Xətai tərəfindən əsası qoyulan bu dövlət Azərbaycan və İran hüdudlarını aşaraq geniş bir ərazini tutdu. I Şah İsmayıl 1506-cı ildə Ərəş və Diyarbəkir vilayətlərini tutdu, 1508-ci ildə Bağdadı, bütün İraqı ələ keçirdi. 1510-cu ildə Şeybani xanla müharibədə qələbə çalan Şah İsmayıl Herat, Mərv, Bəlx şəhərləri ilə bərabər Xorasanı da fəth etdi.

XV-XVI əsrlərdə Təbriz və Şamaxı ölkənin əsas mədəniyyət və elm mərkəzləri idi. Bu dövrdə anadilli ədəbiyyatın sürətli inkişafı müşahidə olunur. Hələ XIII-XIV əsrlərdən İzzəddin Həsənoğlu, Əli, Suli Fəqih, Yusif Məddah, Qazi Bürhanəddin, İmadəddin Nəsimi kimi sənətkarların əsərlərində ən dərin fikirləri, fəlsəfi düşüncələri ifadə etmək gücünü sübut edən Azərbaycan türkcəsində XV əsrdə Cahanşah Həqiqi, Əmir Əfsəhəddin Hidayət, Əhmədi Təbrizi, Dədə Ömər Rövşəni, Şeyx İbrahim Gülşəni, Xətai Təbrizi, Xəlili, Həbibi, Kişvəri, Tüfeyli, Süruri kimi sənətkarlar yazıb-yaratmış, I Şah İsmayılın hakimiyyətə gəlməsindən sonra, XVI əsrin əvvəllərində də anadilli poeziyanı inkişaf etdirmişlər. Şah İsmayıl Xətainin (1487-1524) özü də XV-XVI əsrlərdə ana dilində şeirlər yazan sənətkar olmuşdur.

Səfəvilər dövrü (1501-1736) Azərbaycan ədəbiyyatının səciyyəvi xüsusiyyətlərindən danışarkən ilk növbədə anadilli şeirə və nəsrə (qeyd edək ki, dövrün əksər sənətkarları ikidilli, bəzi hallarda üçdilli olmuşlar, doğma dillə bərabər fars və ərəb dillərdində də əsər yazmışlar), şifahi xalq ədəbiyyatına meylin artdığını nəzərə çatdırmaq lazımdır. Şah İsmayıl Xətai, Xəzani kimi şairlərin əsərlərində xalq

transletrasiyasını isə qarşısında verir. Bu da oxucu və tədqiqatçı üçün son dərəcə vacibdir , çünki mətni asanlıqla qavranılıb şərh edilir.
Biz vətənpərvər ziyalımıza elmi araşdırmalarında uğurlar arzulayırıq. Fəxr edirik ki, bu il 100 illiyini qeyd etdiyimiz Bakı Dövlət Universiteti Firuz müəllim kimi məzunları var. Hələ tələbə ikən Mir Cəlal Müəllimin "Bir gəncin manifesti" əsərini fars dilinə tərcümə edən Firuz Fifahi həm də klassik irsimizin fundamental tədqiqatçılarındandır. Onun şəxsi həyatı da Azərbaycan elmi ictimaiyyəti ilə bağlıdır və həmişə qabaqcıl ziyalılarla ünsiyyətdə olmağı çox xoşlayır. Bu da Firuz müəllimdə geniş elmi dünyagörüş yaratmışdır.
Milli mədəniyyətimizin böyük təəssübkeşi olan Firuz müəllimə həyatda can sağlığı, elmi fəaliyyətində uğurlar diləyirəm. Arzu edirəm ki, əlində olan başqa əlyazmaları da tez bir vaxtda çapa hazırlayıb Azərbaycan xalqının ixtiyarına versin.

***Professor Sənan İbrahimov***
***Bakı Dövlət Universitetinin Professoru***
Bakı 2019

da qeyd edir ki, şair az vaxtda sarayda böyük nüfuz qazanır və əsərlərinə nəzirələr yazılır.
Sürurinin ədəbi irsindən bəhs edənlər bunu da xüsusi qeyd edir ki, o, Nəsimi ədəbi məktəbinin görkəmli nümayəndələrindən olmuş və əsərlərində hürufizmə rəğbətini bildirmişdir.
Bütün bunlar Süruri haqqında indiyədək bildiklərimizdir.
Firuz Rifahi isə şairin indiyədək muzeylərdə və arxivlərdə olan əlyazmalarını toplayıb çap etdirmişdir. İndi əlimizdə olan bu möhtəşəm divan böyük şairimizin nə qədər istedadlı olduğunu sübut edir. Firuz müəllim, sözün həqiqi mənasında, Sürurinin həyatını və yaradıcılığını dərindən tədqiq etmiş və onun barəsində fundamental bir ön sözü yazıb qarşımıza qoymuşdur. Bu tədqiqatda biz nələrin şahidi olmuruq?... Sürurinin şeirlərinə nəzirə yazan şairlərin siyahlısını, əlyazmalarının saxlanıldığı yeri, beytlərin sayı, şeirlərin sayı, əlyazmanın paleoqrafiyası, şəxsi həyatı ilə bağlı nadir məlumatlar və s.
Ən maraqlı cəhət budur ki, Firuz müəllim şairin fars dilində yazdığı şirləri də kitaba daxil edib, onları da oxuculara və tədqiqatçılara təqdim etmişdir. Bu da Sürurinin ədəbi irsini araşdıranlar və onu tədris edənlər üçün geniş imkanlar açır. Artıq şair barəsində əlimizdə bu qədər geniş elmi məlumat olandan sonra onun tədrisi də, tədqiqi də son dərəcə asanlaşır. Bu müqəddəs işi gördüyünə görə biz Firuz müəllimə öz dərin təşəkkürümüzü bildiririk.
Onu da qeyd etmək lazımdır ki, Firuz müəllim klassik ədəbiyyatımızın ən böyük cəfakeşlərindəndir. Onun son on illərdə tərtib etdiyi Əhmədi Təbrizinin “Yusif və Züleyxa”, “Şeyx Əbdül-Rəzzaq” poemaları, Əlinin “Qisseyi-Yusif” poeması, dilçiliyimizə dair Rüstəmi Dərvişin Azərbaycan dilinin qrammatikasına aid kitabları elmi ictimaiyyət arasında sensasiya yaratmışdır. Bu kitab da həmin müqəddəs işin davamıdır.
Firuz Rifahi Azərbaycan mətnşünaslığında yeni üslub və yeni məktəb yaradan alimlərimizdəndir. Məhz onun metodu indi mətnşünaslıqda prioritet sayılır. Belə ki, alim mətnin orijinalını sətrin əvvəlində, onun

| | |
|---|---|
| *Qaməti sərv, gözi nərgis, ruxsarı səmən.* | قامتی سرو کوزی نرکس رخساری سمن. |
| *Səni devdigin üçün cövr aılırsan bana sən,* | سنی سودکم ایچون جور قیلورسن بکا سن، |
| *Sevən olsunmı bəyim, həsrət ilə vay məni.* | سون اولسونمی بکم حسرتله وای منی. |
| *Taki,bu hüsn ilə gördi gözüm, ey mah səni,* | تا که بو حسنله کوردی کوزم ای ماه سنی، |
| *Ki, pərirulərə şahi eyləmiş allah səni.* | که پری رولره شاه ایلمش اللـه سنی. |
| *Sevmişən canu könüldən səni, vallah səni,* | سومشم جان کوکل دن سنی واللـه سنی، |
| *Sevən olsunmı bəyim, həsrət ilə vay məni.* | سون اولسونمی بکم حسرتله وای منی. |
| *Bilməzəm ğəmzələrin necə al eylədilər,* | بلمزم غمزه لرک نیجه آل ایلدیلر، |
| *Ki, cəfa birlə əlif qəddi dal eylədilər.* | که جفا برله الف قدی دال ایلدلر. |
| *Yığılıb müddəilər üstümə , qal eyədilər,* | یغلوب مدعیلر اوستمه قال ایلدلر، |
| *Sevən olsunmı bəyim, həsrət ilə vay məni.* | سون اولسونمی بکم حسرتله وای منی. |
| *Açılıb badi-havadan səri-zülfün şikəni,* | آچلوب باد هوادن سر زلفک شکنی، |
| *Taru mar etdi gül üzi xitteyi Çinu Xütəni.* | تارمار اتدی کل او(زی خطه چین) ختنی. |
| *Necə pünhan edim axir, .. . nedə səni,* | نیجه پنهان ایدم آخر ... ... نیده سنی، |
| *Sevən olsunmı bəyim, həsrət ilə vay məni.* | سون اولسونمی بکم حسرتله وای منی. |
| *Astanından irağ olalıdan can sənəma,* | آستانکدن اراغ اوللیدی جان صنما، |
| *Məni dərd ilə həlak eylədi hicran, sənəma.* | منی دردیله هلاک ایلدی هجران صنما. |
| *Sana mən eyləmişəm bana nə dərman sənəma,* | سکا من ایلمشم باکه نه درمان صنما، |
| *Sevən olsunmı bəyim, həsrət ilə vay məni.* | سون اولسونمی بکم حسرتله وای منی. |
| *Ey Sururi, nəzər etməz ürəgim yarasına,* | ای سروری نظر اتمز یورکوم یاره سنه، |
| *Od düşər, vəh bu həsəddən ciyərim parasına.* | اود دوشر وه بو حسددن جکرم پاره سنه. |
| *Dosta ğəmzəsi olur aşiqi biçarəsinə,* | دوسته غمزسی اولور عاشق بیچاره سنه، |
| *Sevən olsunmı bəyim,həsrət ilə vay məni* | سون اولسونمی بکم حسرتله وای منی |

Belə dərin poetik duyuma malik Süruri haqqında ədəbi-tarixi mənbələr az məlumat verir. Türkiyə təzkirəçisi Lətifi qeyd edir ki, Sürurinin divanı var və bu divan öz poetik xüsusiyyətləri ilə diqqəti cəlb edir. İstedadlı alimimiz Firuz Rifahi məhz həmin məşhur divanı çapa hazırlamış və onun böyük şair olduğunu əyani olaraq sübut etmişdir. Lətifi öz təzkirəsində şairi həm də alim, ədəbiyyatşünas və şərhçi kimi təqdim edir. Deyir ki, Süruri Cəlaləddin Ruminin, Əbdürrəhman Caminin, Mirhüseyn Vaizin məsnəvilərinə şərhlər yazmışdır.

Şairin şəxsi həyatı barəsində əlimizdə geniş məlumat yoxdur. Həsən Çələbinin təzkirəsində şairin həyatı barədə çox az məlumat verilir və qeyd edilir ki, Sultan Səlim Təbrizi fəth edərkən çox şairləri də özü ilə Türkiyəyə aparmışdır. Onlar arasında Süruri də var idi. Təzkirələr onu

## Süruri haqqında nə bilirdik və Firuz Rifahi tədqiqatlarından sonra nəyi öyrəndik

Firuz müəllimin çapa hazırladığı Sururinin divanından əvvəl biz klassikimiz barədə nə bilirdik? Onu bilirdik ki, XV əsr ədəbi prosesində Süruri (..-1520) adlı şairimiz də olmuşdur və XV əsrin sonu XVI əsrin əvvəllərində yaşayıb, Sultan Səlim sarayına yaxın olub, ona qəsidələr həsr etmişdir. Şairin lirik şeirləri o qədər təravətlidir ki, Füzuli kimi dahi onlardan təsirlənmiş və şairin üç qəzəlinə nəzirə yazmışdır. Həmin qəzəllərin mətlə beytləri belədir:

*Ta müənbər kakilin xurşidə salmışdır kəmənd,*
*Bağlamışdır boynumu zənciri-zülfün bənd-bənd...*

*və*

*Könlümü zülfünlə çak zəncirə şeydalanmasın,*
*Sinəmi çak et ki, səndən özgə məvalanmasın...*

*və*

*Bisütuni-ğəmdə bərgi-laleyi-həmrayə baq,*
*Pərdehayi-dideyi-Fərhadi-ğəmfərsayə baq.*

Belə dərin məzmunlu lirik şeirlər göstərir ki, Süruri XV əsrin sonu XVI əsrin əvvəllərindəki ədəbi mühitin ən istedadlı şairlərindən olmuşdur. Mənbələrin verdiyi məlumata görə, şair 1514-cü ildən sonra Türkiyəyə mühacirət edib, Türkiyə ədəbi mühitinin fəal üzvlərindən olmuşdur. Sürurinin yaradıcılığı XV əsr Azərbaycan poetik düşüncəsinin və dilinin bariz nümunəsidir. Onun şeirləri həmin dövrdəki azərbaycanlıların incə poetik zövqündən, dərin fəlsəfi mühakiməsindən xəbər verir:

| | |
|---|---|
| *Saldı sevdalara ol zülfi-səmənsa məni,* | صالدی سودالره اول زلف سمنسا منی، |
| *Eylədi ğəmzələri aləmə düsvay məni.* | ایلدی غمزه لری عالمه رسوای منی. |
| *Sənin üçün dilə düşdüm, gör axı hay,* | سنک ایچون دله دوشدم کور اخی های، |
| *Sevən olsunmı bəyim, həsrət ilə vay məni* | سون اولسونمی بکم حسرتله وای منی.. |
| *Ey üzi gül,saçı sünbül,ləbi ğönçə dəhən* | ای یوزی کل‌سچی‌سنبل لبی غنچه دهن، , |

*Ön sözü yazan və rəyçi:*

*Professor Sənan İbrahimov,Bakı*
*Dövlət Uinversitetinin professoru*

*və*

*Sururinin Divanına giriş sözü yazan:*

*Doktor Paşa Kərimov*
*Azərbaycan Milli Elmlər Akademiyası*
*Məhəmməd Füzuli adına Əlyazmalar*
*İnstitutunun direktor müavini,*
*filologiya elmləri doktoru*

*XV-XVI-cı əsr şairi Sururinin Divanı yeni aşkar edilmiş Kalifornia Ştati Universiteti nüsxəsi əsasında hazırlanıbdır. Burada Suruinin başqa qaynaqlarda olan şeirləri də toplanıbdır.*

*Divan of Amir Sururi XV century, based upon California State University manuscript is compiled and prepared by Firuz Refahi Alamdari. Two other Divans and three Mejmues are referred to for other poems belonging to Sururi.*


*Divan of Amir Sururi- XV century poet*
*Compliled and prepared by Firuz Refahi Alamdari*
*Forward by Prof. Sanan Ibrahimov from BDU University*
*Divan Of Sururi by Dr. Paşa Karimov from Manuscript İnstitute of Acafemy of Science of Azerbaijan Republic*
*Published at Tehran*
*Publisher: Savalan Igitleri*
*First Publication : 2019*
*İSBNI:978-622-673973-3*

# *Amir Sururi*

***Türkcə–Farsca***

# DİVANI



**Hazırlayan**: *Firuz Refahi Ələmdari*